## DUA ET

Əlini aç göyə Rəbbinə sarı
Dua et sən Ona hər an usanma,
Onun əlindədir qeybin açarı
Eləsə qeyrisin ruzigar sanma.

Dünyanı yoxluqdan var edən Allah
Qadirdir duana cavab verməyə,
Yoxdur Ondan başqa haqq olan ilah
Çağırma qeyrisin heç vaxt köməyə.

Rəbbinə yaxınlaş ibadət ilə
Aldanma heç zaman şöhrətə, ada
Ölümün haqlığın sən bilə – bilə
Asilik eyləmə fani dünyada.

Əməl et həm dünya həm axirətçin
Fikirləş…! gör nədən ötrü yarandın?
Bu gün əkin vardır, sabahsa biçin
İnan ki, nə əkdin onu qazandın.

O gün ki, qurular ədalət vəzni
Dünyada nə etdin çıxar qarşına,
Heç bir şey qalmayar Allahdan gizli
Gecikmə qılsana çarə başına

Odur ki, ey insan, haqq – İslama gəl
Xoşbəxtlik taparsan iki dünyada,
Əks olub eyləmə işini əngəl
Unutma bunları hər an sal yada.

***Samin Şirvani***

*Rəhmli və Mərhəmətli Allahın adı ilə*

## ÖN SÖZ

Həqiqətən, şükr və tərif Allaha məxsusdur. Biz Ona həmd-səna edir, Onu köməyə çağırır və Ondan bağışlanma diləyirik. Nəfslərimizin şərindən və pis əməllərimizdən yalnız Ona pənah aparırıq. Allah, kimi doğru yola yönəldərsə onu azdıran, kimi də azdırarsa, doğru yola yönəldən tapılmaz. Şahidlik edirəm ki, Allahdan başqa ibadətə layiq məbud yoxdur. O, təkdir və heç bir şəriki də yoxdur. Yenə də şahidlik edirəm ki, həqiqətən də Məhəmməd Onun qulu və elçisidir.

Hörmətli oxucu, bu kitabın çox hissəsi Şeyx Abdu-l-Aziz ibn Bazın təqdim etdiyi Şeyx Məhəmməd ibn İbrahim əl-Həmədin "əd-Dua" kitabının qalan hissəsi isə öz sözlərim və bir neçə mötəbər kitabların bəhrəsidir.

Kitabın adından məlum olduğu kimi mövzumuz İslam dinində ən mühim məsələlərdən biri olan dua və onun əhkamlarından bəhs edir. Duanın İslamda böyük bir yeri vardır. Çünki dua etmək Allah-təalaya yaxınlaşmağa səbəb olan ən böyük amillərdən biridir. Allah-təala "Qurani-Kərim"də bir neçə ayədə qullarına Ona dua etmələrini əmr etmiş, duanı tərk etməkdən çəkindirmiş, Ona səmimi qəlbdən dua edənlərin savaba nail olduqlarını bildirərək onları mədh etmiş və hətta, duanı ibadət adlandırmışdır. Həqiqətən də dua hər bir xeyrin açarı və hər bir şərin qıfılıdır. Duanın Allah- təalaya ən sevimli bir əməl olduğu üçün Öz müqəddəs kitabı olan "Qurani- Kərim"i dua ilə başlayaraq dua ilə bitirmişdir. "Quran"ın ilk surəsi olan "əl-Fatihə" surəsinə nəzər salsaq görərik ki, Allah-təala qullarının Ona necə dua etmələrini öyrədərək istənilən nemətlər içərisində ən qiymətli və ən əzəmətli nemət olan hidayət (doğru yol)

istəmələrini əmr etmişdir. Həmçinin "Quran"ın son surəsi olan "ən-Nəs" surəsinə nəzər salsaq, yenə də görərik ki, Allah-təala bizə əmr edərək cinlərdən və insanlardan olan şeytanların şərindən Ona dua edərək sığınmağımızı buyurmuşdur. Şübhə yoxdur ki, "Quran"ın dua ilə başlayaraq dua ilə bitməsi duanın İslamda çox böyük əhəmmiyyətli bir əməl olmasına dəlalət edir. Ümumiyyətlə hər bir müsəlmanın duaya ehtiyacı vardır.

Əgər Allah- təala bir kəsə ölkə başçısı olmağı qismət etmişdirsə, ölkəsinin sabit olması, rəiyyətinə qarşı adil olması və özünü rəiyyətə, rəiyyətini də özünə sevdirməsi üçün Allaha üz tutub dua etməsinə ehtiyacı vardır.

Əgər bir kəsə Allahın dininə dəvətçi olmaq qismət olmuşdursa, elmli, haqq üzərində sabitqədəm, dəvət əsnasında başına gələcək əziyyətlərə səbr edərək dözümlü olması və dəvətinin insanlar tərəfindən qəbul edilməsi üçün Allaha daima dua etməsinə ehtiyacı vardır.

Həmçinin, əgər bir kəsə xəstəlik və ya çətinlik üz vermişdirsə Allahın ona şəfa verməsi və çətinliyini aradan qaldırması üçün əl açaraq Rəbbinə dua etməsinə ehtiyacı vardır.

Duanın həyatda  bu qədər böyük rolu olduğuna görə hər bir müsəlmana duanın əhkamlarını bilərək ona əməl etməsi yaxşı olardı ki, etdiyi duası düzgün, səmərəli və Allah tərəfindən qəbul olunmuş olsun.

***Samin Şirvani***

## DUANIN FƏZİLƏTİ

Duanın fəzilətinə dair bir neçə ayə və hədisləri qeyd etmək yerində olardı ki, qoy dua edən hər bir kəs etdiyi duasına görə Allah- təala tərəfindən hansı mükafatlara layiq olduğunu bilərək dua etməkdən heç bir zaman usanmasın.

Duanın fəzilətinə dair bir neçə ayə və hədislər aşağıdakılardır:

### 1. Dua etmək Allaha itaət və Onun əmrini yerinə yetirməkdir

Allah-təala Qurani-Kərimdə buyurmuşdur:

﴿وَقَالَ رَبُّكُمُ ادْعُونِي أَسْتَجِبْ لَكُمْ إِنَّ الَّذِينَ يَسْتَكْبِرُونَ عَنْ عِبَادَتِي سَيَدْخُلُونَ جَهَنَّمَ دَاخِرِينَ﴾

**“Rəbbiniz buyurdu: Mənə dua edin, Mən də sizin dualarınızı qəbul edim...”**[1]

Həmçinin, buyurmuşdur:

﴿وَادْعُوهُ مُخْلِصِينَ لَهُ الدِّينَ﴾

**“Allaha qarşı səmimi olub Ona dua edin.”** [2]

□

### 2. Allaha qarşı olan təkəbbürlükdən uzaq olmaqdır

Allah-təala buyurmuşdur:

﴿وَقَالَ رَبُّكُمُ ادْعُونِي أَسْتَجِبْ لَكُمْ إِنَّ الَّذِينَ يَسْتَكْبِرُونَ عَنْ عِبَادَتِي سَيَدْخُلُونَ جَهَنَّمَ دَاخِرِينَ﴾

---

[1] - 40) “Ğafir” - 60.

[2] - 7) “əl-Əraf”- 29.

**"Rəbbiniz buyurdu: Mənə dua edin, Mən də sizin dualarınızı qəbul edim. Mənə ibadət etməyi təkəbbürlərinə sığışdırmayanlar Cəhənnəmə zəlil olaraq girəcəklər!"** [3]

Şövkani *(rahiməhullah)* bu ayənin təfsirində demişdir: "Ayə duanın ibadətdən olduğuna sübutdur. Çünki Allah-təala qullarına Ona dua etmələrini əmr etmiş və sonra isə buyurmuşdur:

**"...Mənə ibadət etməyi təkəbbürlərinə sığışdırmayanlar..."**

Bu ayədən məlumdur ki, həqiqətən də, dua ibadətdir və Allah-təalaya dua etməyi tərk etmək isə ən böyük bir təkəbbürlükdür..."[4]

**3. Dua ibadətdir**

Keçən ayəyə və bu hədisə görə. Nöman ibn Bəşirdən *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Dua ibadətdir."***[5]

**4. Dua Allah yanında ən hörmətli əməldir**

Əbu Hureyrədən *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Allah üçün duadan hörmətli şey yoxdur."*** [6]

**5. Qulun dua etməsini Allah-təala sevir**

İbn Məsuddan *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Allahın (dua edərək ) fəzilətindən istəyin, həqiqətən də, Allah Ondan istənilməsini sevər."*** [7]

---

[3] - 40) "Ğafir"- 60.

[4] - "Tuhfətu-z-zəkirin." Səh. 29.

[5] - Tirmizi, 2969-cu hədis, Albani səhihləşdirmişdir: "Sahihu-l-cəmi", 3407-ci hədis.

[6] - Əhməd, 2/362; İbn Macə, 3829-cu hədis, Albani həsənləşdirmişdir: "Sahihu-l-ədəbi-l-mufrad" 549-cu hədis.

**6. Dua Allahın qəzəbinin qarşısını alır**

Əbu Hureyrədən *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

"***Allah ondan istəməyənə qəzəblənər.***" [8]

Şövkani *(rahiməhullah)* demişdir: "Bu hədis qulun Rəbbinə dua etməsinin ən mühim vacibatlardan və ən böyük fərzlərdən olmasına dəlalət edir. Çünki Allahın qəzəbləndiyi əməldən uzaq olmağın vacibliyində ixtilaf yoxdur". [9]

**7. Dua etmək acizlikdən uzaq olmaqdır**

Əbu Hureyrədən *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"İnsanların ən acizi dua etməkdə acizlik edən və ən xəsisi isə salam verməkdə xəsislik edəndir."***[10]

**8. Edilən hər bir dua Allah yanında müxtəlif cür qəbuldur**

Əgər dua edən duanın bütün şərtlərini yerinə yetirərsə, Allahın izni ilə etdiyi duasından ona mütləq nəsib vardır:

Əbu Səid əl-Xudridən *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Hər bir müsəlman günah və qohumluq əlaqələrinin kəsilməsini tələb etmədən dua edərsə, Allah-təala ona bu üç şeydən birini mütləq verər: Ya istədiyini tezliklə verər, ya Qiyamət gününə saxlayar, ya da ki, etdiyi duasına bərabər olan bəlanı ondan uzaqlaşdırar. Səhabə dedi: Onda [duanı] çoxaldaqmı?***

---

[7] - ət-Tirmizi, 3571-ci hədis. Albani səhihləşdirmişdir. "Silsilətu-l-əhədisi-d-daifə" 492-ci hədis.

[8] -- Əhməd, 2/442; ət-Tirmizi, 3373-cü hədis. Albani həsənləşdirmişdir. "Sahihu-l-ədəbi-l-mufrad" 512-ci hədis.

[9] - "Tuhfətu-z-zəkirin" səh. 31.

[10] - İbn Hibban, 1939-cu hədis. Albani səhihləşdirmişdir. "Sahihu-l-cəmi" 1044.

***Peyğəmbər (sallallahu aleyhi va əlihi va səlləm) dedi: Allah daha çox əta edən və cavab verəndir."*** [11]

İbn Həcər *(rahiməhullah)* demişdir: "Hər bir duaya cavab verilir. Lakin cavablar müxtəlif olur. Bəzən edilən duanın özü qəbul olur, bəzən də əvəzi verilir." [12]

**9. Dua bəlanın baş verməsinin qarşısının alınmasına səbəb olur**

Sovbandan *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Qədəri yalnız dua qaytarır."*** [13]

Şövkani *(rahiməhullah)* bu hədis barədə demişdir: "Hədis Allah-təalanın qul üçün yazdığı qəza-qədəri [bəlanı] dua ilə qaytarmasına dəlalət edir. Bu barədə çoxlu hədislər varid olmuşdur. Hasil olan odur ki, duanın özü də Allahın qədərindəndir. Qulu üçün muqayyəd [asılı] olan bir qəza-qədəri yazar ki, dua etməzsə qəza-qədər baş versin, lakin Ona dua edərsə, həmin qəza-qədər ondan dəf olsun." [14]

**10. Dua bəlanın baş verməsindən sonra qaldırılmasına səbəb olur**

Abdullah ibn Ömərdən (radiyallahu anhumə) rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

"***Sizdən kimə dua qapısı açılarsa, [çoxlu dua edərsə], onun üçün rəhmət qapıları da açılar [duasına cavab verilir]. İstənilən şeylər arasında Allaha ən sevimli olanı Ondan afiyət istənilməsidir. Dua üz vermiş bəlanın dəf olmasına və üz***

---

[11] - Əhməd, 3/18; Albani səhihləşdirmişdir, "Sahihu-l-ədəbi-l-mufrad" 574-cü hədis.

[12] - "Fəthu-l-bəri" 11/95.

[13] - Əhməd, 5/277; ibn Macə, 90-cı hədis. Albani həsənləşdirmişdir, "Sahihu-l-cami" 7687-ci hədis.

[14] "Tuhfətu-z-zəkirin" səh. 29-30.

*vermәmiş bәlanın isә baş vermәmәsinә sәbәb olur. Ey Allahın qulları dua edin."* [15]

Həmçinin, buyurmuşdur:

*"Qәdәrdәn hәzәr etmәyin [çәkinmәyin] heç bir faydası yoxdur. Dua isә enmiş bәlanın dәf olmasına vә enmәmiş bәlanın baş vermәmәsinә sәbәb olur. Hәqiqәtәn dә, dua bәla ilә qarşılaşaraq Qiyamәt gününә qәdәr [onun qarşısını almaq üçün] mübarizә aparar."* [16]

**11. Dua etmək insanlar arasında məhəbbətin yaranmasına səbəb olur**

Əgər müsəlman, digər bir müsəlman üçün onun xəbəri olmadan, gizlicə dua edərsə, Allah-təala onun duasını qəbul edər,[17] aralarında bir-birilərinə qarşı məhəbbət və ülfət yaradar.

Allah-təala buyurmuşdur:

﴿إِنَّ الَّذِينَ آمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ سَيَجْعَلُ لَهُمُ الرَّحْمَنُ وُدًّا﴾

**"Həqiqətən, iman gətirib yaxşı işlər görənlər üçün Allah[ürəklərdə]bir sevgi yaradacaqdır.[Allah həm özü onları dost tutacaq, həm də onların məhəbbətini hamının, o cümlədən, möminlərin qəlbinə salacaqdır]."** [18]

Şübhəsiz ki, dua etmək imandan və yaxşı əməllərdəndir.

**12. Dua etmək Allahın mömin bəndələrinin sifətlərindəndir**

Allah-təala peyğəmbərlərini (aleyhimu-s-sələm) mədh edərək buyurmuşdur:

---

15 - Tirmizi, 3548-ci hədis, Albani həsənləşdirmişdir. "Sahihu-l-cəmi" 3409-cu hədis.

16 - Tabərani, əl-Ovsat, 2519-cu hədis, Albani həsənləşdirmişdir. "Sahihu-l-cəmi" 7739-cu hədis.

17 - bax: səh, 42.

18 - 19) "Məryəm" - 96.

﴿إِنَّهُمْ كَانُوا يُسَارِعُونَ فِي الْخَيْرَاتِ وَيَدْعُونَنَا رَغَبًا وَرَهَبًا وَكَانُوا لَنَا خَاشِعِينَ﴾

**“Onlar xeyirli işlər görməyə tələsər [yaxşı əməllər etməkdə bir-birini ötməyə çalışar], rəğbət və qorxu ilə [rəhmətimizə ümid bəsləyib əzabımızdan qorxaraq] Bizə dua edərdilər. Onlar Bizə müti idilər.”**[19]

Həmçinin, saleh qulları haqqında buyurmuşdur*:*

﴿وَالَّذِينَ جَاؤُوا مِن بَعْدِهِمْ يَقُولُونَ رَبَّنَا اغْفِرْ لَنَا وَلِإِخْوَانِنَا الَّذِينَ سَبَقُونَا بِالْإِيمَانِ وَلَا تَجْعَلْ فِي قُلُوبِنَا غِلًّا لِّلَّذِينَ آمَنُوا رَبَّنَا إِنَّكَ رَؤُوفٌ رَّحِيمٌ﴾

**“Onlardan [Mühacirlərdən və Ənsardan] sonra gələnlər belə deyərlər: Ey Rəbbimiz, bizi və bizdən əvvəl iman gətirmiş [din] qardaşlarımızı bağışla. Bizim qəlblərimizdə iman gətirənlərə qarşı kinə, həsədə yer vermə. Ey Rəbbimiz, Sən həqiqətən şəfqətli və mərhəmətlisən.”** [20]

### 13. Dua etmək sabit olmağa və düşmən üzərində qələbə çalmağa səbəb olur

Allah-təala Talut və onun ordusu Calut və onun ordusu ilə qarşılaşaraq üz-üzə gəldikləri haqda buyurmuşdur*:*

﴿وَلَمَّا بَرَزُواْ لِجَالُوتَ وَجُنُودِهِ قَالُواْ رَبَّنَا أَفْرِغْ عَلَيْنَا صَبْرًا وَثَبِّتْ أَقْدَامَنَا وَانصُرْنَا عَلَى الْقَوْمِ الْكَافِرِينَ﴾

**“Onlar Calut və əsgərləri ilə qarşılaşdıqları zaman dedilər: Pərvərdigara, bizə bollu səbr və ayaqlarımıza qüvvət ver! Bizə kafir qövm üzərində qələbə qazandır!”** [21]

Etdikləri duanın nəticəsi necə oldu?

---

[19] - 21) “əl-Ənbiyə” - 90.

[20] - 59) “əl-Həşr” - 10.

[21] - 2) “əl-Bəqərə” - 250.

﴿فَهَزَمُوهُم بِإِذْنِ اللّهِ وَقَتَلَ دَاوُدُ جَالُوتَ وَآتَاهُ اللّهُ الْمُلْكَ وَالْحِكْمَةَ وَعَلَّمَهُ مِمَّا يَشَاء وَلَوْلاَ دَفْعُ اللّهِ النَّاسَ بَعْضَهُمْ بِبَعْضٍ لَّفَسَدَتِ الأَرْضُ وَلَكِنَّ اللّهَ ذُو فَضْلٍ عَلَى الْعَالَمِينَ﴾

**“Nəhayət onlar Allahın izni ilə Calutu və qoşununu məğlub etdilər və Davud Calutu öldürdü...”** [22]

[22] - 2) “əl-Bəqərə” - 251.

## DUANIN ŞƏRTLƏRİ

Duanın Allah yanında qəbul olması üçün bir neçə şərtləri vardır ki, onları mütləq yerinə yetirmək lazımdır. Həmin şərtlər bunlardır.

**1. Dua edən bilməlidir ki, onun duasına cavab verməyə qadir olan yalnız Allahdır və həmçinin, bilməlidir ki, Allahdan başqa heç kəs ona nə xeyir verə bilməz nə də ki, ondan bir zərəri uzaqlaşdıra bilməz.**

Allah-təala buyurmuşdur:

﴿أَمَّن يُجِيبُ الْمُضْطَرَّ إِذَا دَعَاهُ وَيَكْشِفُ السُّوءَ وَيَجْعَلُكُمْ خُلَفَاءَ الْأَرْضِ أَإِلَٰهٌ مَّعَ اللَّهِ قَلِيلًا مَّا تَذَكَّرُونَ﴾.

**“[Ey Məhəmməd, de ki, Allahdan qeyrilərinə ibadət etdikləriniz yaxud köməyə çağırdıqlarınız yaxşıdır] yoxsa əli hər yerdən üzülüb darda qalan bir kimsə Ona dua etdiyi zaman onun duasını qəbul buyuran, [sizdən] şəri sovuşduran, sizi yer üzünün varisləri edən kəs? Məgər Allahla yanaşı başqa bir haqq ilahmı var, Siz nə az düşünüb daşınırsınız!”** [23]

**2. Allahdan qeyrisinə dua etməmək** [24]

Allahdan qeyrisinə dua edən kəs Allaha şərik qoşmuş və bağışlanmayan böyük bir günah etmiş sayılır.

Allah-təala buyurmuşdur:

﴿إِنَّ اللَّهَ لَا يَغْفِرُ أَن يُشْرَكَ بِهِ وَيَغْفِرُ مَا دُونَ ذَٰلِكَ لِمَن يَشَاءُ وَمَن يُشْرِكْ بِاللَّهِ فَقَدْ ضَلَّ ضَلَالًا بَعِيدًا﴾

---

[23] - 27) “ən-Nəml” - 62.

[24] - bax: səh, 96.

**“Allah Ona şərik qoşmağı əsla bağışlamaz. Bundan aşağı olan günahları isə istədiyi şəxsə bağışlar. Allaha şərik qoşan şəxs şübhəsiz ki, [haqq yoldan] çox azmışdır.”** [25]

Peyğəmbərimiz *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

*“**İstədiyin vaxt Allahdan istə, kömək istədiyin zaman Allahdan kömək istə.**”* [26]

**3. Allaha düzgün olan təvəssüllərlə təvəssül etmək [yaxınlaşmaq] və bidət təvəssüllərdən uzaq olmaq**

**Şəriətdə icazəli olan təvəssüllərin bir neçəsi bunlardır**.

**a). Allahın adlarından yaxud sifətlərindən biri ilə Ona təvəssül etmək**

Necə ki, Peyğəmbərimiz *(sallallahu aleyhi va əlihi va səlləm)* bəzi dualarında deyərdi:

***“...Allahım, özünü adlandırdığın bütün adlarınla Səndən istəyirəm...”***[27]

Yaxud tələb olunan duaya münasib olan ad seçmək. Yəni: Bağışlanma istəyərkən Allahı əl-Ğafur [bağışlayan] adı ilə, ruzi diləyərkən ər-Razzəq [ruzi verən] və ya əl-Vahhəb [əta edən-hədiyyə verən] adı ilə, elm istəyərkən əl-Alim [hər şeyi bilən] adı ilə və s. çağıraraq dua etmək.

Allah-təala buyurmuşdur:

﴿وَلِلَّهِ الأَسْمَاءُ الْحُسْنَى فَادْعُوهُ بِهَا﴾

[25] - 4) “ən-Nisə” - 116.

[26] - Əhməd, 1/293; Tirmizi, 2511-ci hədis, Albani səhihləşdirmişdir, “Sahihu-l-cəmi” 7957-ci hədis.

[27] - Əhməd, 1/391, Albani səhihləşdirmişdir, “Silsilətu-l-əhədisi-s-sahihə” 199-cu hədis.

**“Allahın gözəl adları vardır. Onu həmin adlarla çağırıb dua edin...”**[28]

Allahın sifəti ilə təvəssül etmək. Yəni: Allahım, mən Səndən Sənin uca sifətlərinlə, hər şeyi əhatə edən rəhmətinlə, əzəmətinlə və s. istəyirəm deyərək duaya başlamaq.

**b). Allaha saleh əməllərlə təvəssül etmək**

Məsələn; Allahım, mən Sənə iman etdiyim üçün, Səni sevdiyim üçün, Rəsuluna tabe olduğum üçün Səndən istəyirəm deyərək duaya başlamaq. Yaxud duadan öncə etdiyi saleh əməli zikr edərək həmin əməllə Allaha təvəssül etmək.

Allah-təala buyurmuşdur:

﴿الَّذِينَ يَقُولُونَ رَبَّنَا إِنَّنَا آمَنَّا فَاغْفِرْ لَنَا ذُنُوبَنَا وَقِنَا عَذَابَ النَّارِ﴾

**“O bəndələr ki, Pərvərdigara, biz həqiqətən Sənə iman gətirmişik günahlarımızı bağışlayıb bizi Cəhənnəm əzabından qoru deyirlər.”** [29]

Həmçinin, buyurmuşdur:

﴿رَبَّنَا إِنَّنَا سَمِعْنَا مُنَادِيًا يُنَادِي لِلإِيمَانِ أَنْ آمِنُواْ بِرَبِّكُمْ فَآمَنَّا رَبَّنَا فَاغْفِرْ لَنَا ذُنُوبَنَا وَكَفِّرْ عَنَّا سَيِّئَاتِنَا وَتَوَفَّنَا مَعَ الأبْرَارِ﴾

**“[O kəslər ki, deyərlər:] Ey Rəbbimiz, həqiqətən biz Rəbbinizə inanın deyə imana tərəf çağıran bir kimsənin [Rəsulunun] çağırışını eşidib Sənə iman gətirdik. İndi günahlarımızı bağışla, təqsirlərimizdən keç və canımızı yaxşı əməl sahibləri ilə bir yerdə al!”** [30]

---

[28] - 7) “əl-Əraf” - 180.

[29] - 3) “Əli İmran” - 16.

[30] - 3) “Ali İmran” - 193.

**c). Allaha saleh, diri və qadir olan adamın duası ilə təvəssül etmək**

Ənəs *(radiyallahu anhu)* rəvayət edir ki;

***"Peyğəmbər (sallallahu aleyhi va əlihi va səlləm) cümə günü xütbə verərkən bir bədəvi gələrək Ona yağışın yağmadığına görə çətinlikdə olduqlarından şikayət edir. Peyğəmbər (sallallahu aleyhi va əlihi va səlləm) yağışın yağması üçün Allaha dua edir. Minbərdən enməmiş yağışın suyu Onun saqqalından damcıldamağa başlayır."*[31]**

Pis aqibətlə nəticələnməmək şərti ilə[32] saleh insandan dua etməsini istəməyə dair bir neçə sübutlar vardır.

**ç). Dua edənin ehtiyaclı, zəif, günahkar və təqsirli olduğunu etiraf edərək təvəssül etməsi**

Məsələn; Allahım, mən Sənin Sənə möhtac olan və günahkar bir qulunam məni bağışlamağını istəyirəm və s. demək.

Allah-təala Yunus (aleyhi-s-sələm) haqqında buyurmuşdur:

﴿وَذَا النُّونِ إِذ ذَّهَبَ مُغَاضِبًا فَظَنَّ أَن لَّن نَّقْدِرَ عَلَيْهِ فَنَادَى فِي الظُّلُمَاتِ أَن لَّا إِلَهَ إِلَّا أَنتَ سُبْحَانَكَ إِنِّي كُنتُ مِنَ الظَّالِمِينَ. فَاسْتَجَبْنَا لَهُ وَنَجَّيْنَاهُ مِنَ الْغَمِّ وَكَذَلِكَ نُنجِي الْمُؤْمِنِينَ﴾

**"...[Yunus] qaranlıqlar içində Pərvərdigara, Səndən başqa heç bir tanrı yoxdur. Sən pak və müqəddəssən. Mən isə həqiqətən zalimlərdən olmuşam[əmrinə qarşı çıxaraq özümə zülm etmişəm] –deyib dua etmişdi.**

**Biz onun duasını qəbul buyurduq və onu qəmdən qurtardıq. Biz möminlərə belə nicat verərik."**[33]

---

[31] - əl-Buxari, 933-cü hədis; Muslim, 897-ci hədis.

[32] -bax: səh, 111.

[33] - 21) "əl-Ənbiyə" - 87-88.

**4. Duanın qəbuluna tələsməkdən çəkinmək**

İnsan dua edərkən duanın qəbul olmasına tələsməməlidir. Əgər duanın qəbulunun gecikdiyini görərsə "nə üçün gecikdi" deməməlidir. Çünki tələsmək duanın qəbulunun qarşısını alan səbəblərdən biridir. Əbu Hureyrədən rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Hər birinizin duası tələsmədikcə qəbul olar. [Tələsmək odur ki,] deyər: Dua etdim lakin qəbul olmadı."***[34]

Həmçinin, buyurmuşdur:

***"Qul tələsmədən, günah və qohumluq əlaqələrinin kəsilməsi üçün dua etmədikcə diləyi qəbul olmaqda davam edər." Deyildi: "Ey Allahın Rəsulu, tələsmək nədir?" Peyğəmbər (sallallahu aleyhi va əlihi va səlləm) buyurdu: "Deyər: Çoxlu dua etdim lakin qəbulunu görmədim. O zaman bezər və duanı tərk edər.""*** [35]

**5. Xeyirli dua etmək**

Allah yanında duanın qəbul olunması üçün dua xeyirli, günah və qohumluq əlaqələrinin kəsilməsi barədə olmamalıdır. Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Bir qul günah və qohumluq əlaqələrinin kəsilməsi üçün dua etməzsə duası qəbul olar."*** [36]

**6. Allah haqqında yaxşı zəndə olmaq**

Əbu Hureyrədən *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Allaha dua edərkən dualarınızı qəbul edəcəyinə yəqin olduğunuz halda edin."*** [37]

---

[34] - əl-Buxari, 6340-cı hədis; Muslim, 2735.

[35] - Muslim, 2736-cı hədis.

[36] - Buxari, 655-ci hədis; Müslim, 2735-ci hədis.

Həmçinin, buyurmuşdur:

***"Mən qulumla mənə qarşı olan zənninə görə davranaram..."*[38].**

İnsan Rəbbinə dua etdiyi zaman onun duasına cavab verəcəyinə, tövbə etdiyi zaman tövbəsini qəbul edəcəyinə, bağışlanma dilədiyi zaman bağışlayacağına və yaxşı əməl etdiyi zaman savab verəcəyinə səmimi qəlbdən iman etməlidir. Lakin günahlarda davam edərək və əməldə müqəssir olaraq Allah-təalanın onu bağışlayacağını, savab və duasına cavab verəcəyini zənn etmək heç də Allah haqqında yaxşı zəndə olmaq deyildir. Əksinə, bu qürurdan və cəhalətdən doğan batil arzulardır.

**7. Qəlbin ayıq olması**

Qul dua edərkən qəlbi ayıq olmalı, nə dediyini anlamalı və dua edilənin böyüklüyünü dərk etməlidir. Çünki bəzən insan əzbərlədiyi yaxud hər dəfə təkrarladığı duanı adət halına çevirərək dili ilə deyir, lakin qəlbi ilə başqa yerdə olur, nə üçün və kimə dua etdiyinə məhəl qoymur. Belə etmək duanın qəbul olunmasına mane olan ən böyük amillərdəndir.

Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Bilin ki, Allah-təala ayıq olmayan (dilin nə dediyini anlamayan) qəlbdən edilən duanı qəbul etməz. "*[39]**

**8. Duanın şəriətdə icazəli olması**

Bəyənilir ki, edilən dua "Quran"da dua halında keçən ayələrdən, yaxud sünnədən olsun. Lakin insan ürəyindən keçən hər hansı bir duanı istədiyi şəkildə edə bilər. Bir şərtlə ki, şəriətə

---

37 - Tirmizi, 3479-cu hədis, Albani həsənləşdirmişdir. "Sahihu-l-Cəmi", 245-ci hədis.

38 - Buxari, 7405-ci hədis; Müslim, 2675-ci hədis.

39 - Tirmizi, 3479-cu hədis, Albani həsənləşdirmişdir. "Sahihu-l-Cəmi", 245-ci hədis.

zidd olan, yəni Allaha yaxınlaşmaq üçün edilən bidət təvəssüllərdən, şirkdən və s. uzaq olsun.

**9. Yemək və geyimin halal olması**

Bəziləri vardır ki, haram mallarla; oğurluqla, donuz əti yeməklə, içgi içməklə və s. qidalanar və sonra da dualarının qəbul olmadığından şikayətlənərlər. Halbu ki, haram yemək duanın qarşısını alan ən böyük amillərdəndir.

Allah-təala buyurur:

﴿ إِنَّمَا يَتَقَبَّلُ اللّهُ مِنَ الْمُتَّقِينَ﴾

**"Allah yalnız müttəqilərdən [Ondan qorxanlardan] qəbul edər!"** [40]

Şübhəsiz ki, azuqəsi haram olan insan Allahdan layiqincə qorxan deyildir.

Həmçinin, Peyğəmbər *(sallallahu aleyhi va əlihi va sælləm)* buyurmuşdur:

***"Həqiqətən də, Allah pakdır və yalnız pakı qəbul edər..."*** [41]

Başqa bir hədisdə haram geyib haram ilə qidalanaraq dua edən barəsində buyurmuşdur:

***"…O, əllərini göyə qaldıraraq "ey Rəbb, ey Rəbb", – deyər. Onun yeməyi, içməyi, geyimi və qidası haram olduğu halda duası hardan qəbul olunar?"***[42]

**10. Dua edərkən səsi ucaldaraq həddi aşmamaq**

Allah-təala buyurmuşdur:

﴿ادْعُواْ رَبَّكُمْ تَضَرُّعًا وَخُفْيَةً إِنَّهُ لاَ يُحِبُّ الْمُعْتَدِينَ﴾

---

40-5) "əl-Məidə" - 27.

41- Müslim, 1115-ci hədis.

42 -Muslim, 1015.

**“Rəbbinizə yalvara-yalvara, həm də gizlicə dua edin. Şübhəsiz ki, O, həddi aşanları [qışqıraraq dua edənləri] sevməz!”** [43].

Həmçinin, buyurmuşdur:

﴿ وَلاَ تَجْهَرْ بِصَلاَتِكَ وَلاَ تُخَافِتْ بِهَا وَابْتَغِ بَيْنَ ذَلِكَ سَبِيلاً﴾

**“Dua edərkən səsini nə çox qaldır, nə də çox alçalt. Bunun [bu iksinin] arasında orta bir yol tut!”** [44].

[43]-7) “əl-Əraf” - 55.
[44]-17) “əl-İsra” - 110.

## DUANIN ƏDƏBLƏRİ

Duanın şərtləri olduğu kimi, eləcə də ədəbləri vardır. Duanın kamil olması üçün bu ədəbləri yerinə yetirmək bəyənilir.

**1. Dua edərkən dəstəmazlı olmaq**

Əbu Musa əl-Əşari *(radiyallahu anhu)* belə rəvayət edir:

***"Peyğəmbər (sallallahu aleyhi va əlihi va səlləm) Hüneyn döyüşü qurtardıqdan sonra su gətizdirdi, dəstəmaz aldı və sonra əllərini qaldıraraq dedi: "Allahım, Ubeyd Əbu Amiri bağışla" və mən onun qoltuğunun altını gördüm."*** [45]

**2. Dişləri sivakla təmizləmək**

Çünki dua dil ilə edilən ibadətdir və ağızın dua edərkən təmizlənməsi gözəl ədəblərdəndir. Necə ki, sünnədə namaz üçün ağızı misvak ilə təmizləmək varid olmuşdur. Bundan məqsəd namazda zikr edən yerin təmizlənməsidir ki, o da ağızdır.[46]

**3. Qibləyə yönəlmək**

Ömər ibn əl-Xəttab *(radiyallahu anhu)* deyir:

***"Bədr döyüşü günü Peyğəmbər*** *(sallallahu aleyhi va əlihi va səlləm)* ***müşriklərə baxdı və gördü ki, onlar min nəfər, səhabələri isə üç yüz on doqquz nəfərdirlər. Allahın Peyğəmbəri qibləyə yönələrək əllərini qaldırdı və Rəbbini çağırmağa başladı..."*** [47]

Həmçinin, Abdullah ibn Məsuddan rəvayət olunur ki:

***"Peyğəmbər (sallallahu aleyhi va əlihi va səlləm) Kəbəyə yönəldi və Qureyşdən olan bir neçə nəfərə bəd dua etməyə başladı."*** [48]

Dua edərkən qibləyə yönəlmək vacib deyil, lakin duanın ədəblərindəndir. Çünki bir neçə hədislərdə varid olmuşdur ki, Peyğəmbərimiz *(sallallahu aleyhi va əlihi va səlləm)* qibləyə yönəlmədən də dua etmişdir.

---

[45]- Buxari, 4323-cü hədis; Müslim, 2498-ci hədis.

[46]- Şövkani, "Tuhfətu-z-zəkirin" səh.44.

[47]- Müslim, 1763-cü hədis.

[48]- Buxari,3960-cı hədis.

Ənəs *(radiyallahu anhu)* belə söyləyir:

***“Peyğəmbər (sallallahu aleyhi va əlihi va səlləm) Cümə günü xütbə verdiyi zaman bir kişi qalxaraq dedi: “Ey Allahın Rəsulu! Allaha dua et yağış yağdırsın.” Peyğəmbər (sallallahu aleyhi va əlihi va səlləm) dua edir, göy buludlanır və yağış yağmağa başlayır...”*** [49]

Aydındır ki, xütbə verən zaman arxa qibləyə tərəf olur. Hədisdən məlum olur ki, dua edərkən qibləyə yönəlmək şərt deyildir, lakin bəyənilən bir əməldir.

**4. Əlləri qaldırmaq**

Duanın ən böyük ədəblərindən biri də, dua edərkən əlləri qaldırmaqdır.Çünki qul əllərini Rəbbinə tərəf qaldırmaqla özünün Ona olan acizliyini bildirir.

Syuti *(rahiməhullah)* demişdir: “Artıq Peyğəmbərdən *(sallallahu aleyhi va əlihi va səlləm)* yüzə yaxın hədisdə dua edərkən əllərini qaldırdığı varid olmuşdur” [50].

Əbu Musa əl-Əşaridən *(radiyallahu anhu)* rəvayət olunur ki:

***“Peyğəmbər (sallallahu aleyhi va əlihi va səlləm) əllərini qaldıraraq dua etdi və mən onun qoltuğunun altını gördüm.”*** [51]

Salman əı-Farsidən *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***“Həqiqətən Rəbbiniz utanan və səxavətlidir. Qulu əllərini Ona uzadarsa, boş qaytarmasına utanar.”*** [52]

**Dua edərkən əlləri qaldırmağın ədəbləri**

Dua edərkən əlləri qaldırmaq üç cür olur:

Abdullah ibn Abbasdan *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

---

49- Buxari, 6342-ci hədis.

50- “Tədribu-r-ravi”, 2/180.

51- Buxari, 7/198.

52- əbu Davud, 1488-ci hədis. Albani səhihləşdirmişdir. “Sahihu-l-cəmi”, 1753-cü hədis.

***"İstəmək [dua] - odur ki, əllərini çiyinlərinə bərabər, yaxud yaxın tutaraq qaldırasan. İstiğfar [bağışlanma diləmək] - odur ki, bir barmağınla [şəhadət barmağınla] işarə edəsən. İbtihəl [yalvarmaq] - odur ki, əllərini [qollarınla] birlikdə qaldırasan."***[53]

Adı çəkilən bu üç növ əl qaldırmağın qaydası açıq şəkildə Peyğəmbərimizin *(sallallahu aleyhi va əlihi va səlləm)* əməli ilə bizə məlum olmuşdur. Bunları üç məqama da ayırmaq olar:

a). Ümumi duanın məqamı - buna istəmək, yaxud da, dua deyilir.

**Qaydası:** Əllərini çiyinlərinə bərabər, yaxud yaxın tutub ovucunu açaraq bir-birinə birləşdirirsən və əllərinin içini göyə, üstünü isə yerə, yaxud, içini üzünə üstünü isə qibləyə tərəf tutursan. Bu məqamdan Vitir namazında qunut tutarkən, istisqa [yağış] duası edərkən, həcc vaxtı əllərin qaldırılması sünnə olan altı yerdə dua edərkən, yaxud da, hər hansı bir vaxtda dua etmək istəyərkən istifadə edilir.

b). Bu məqama İstiğfar, yaxud da, İxlas deyilir.

**Qaydası:** Sağ əlinin şəhadət barmağını qaldırırsan. Bu məqamdan əsasən zikr edərkən, xütbədə dua edərkən, namazda təşəhhüd oxuyarkən, namaz xaricində təhlil [lə iləhə illəllah], təsbih [Subhənallah] deyərkən istifadə edilir.

İmarə ibn Rueybədən *(radiyallahu anhu)* rəvayət olunur ki, o, Bişr ibn Mərvanın minbər üzərində əllərini qaldırdığını görür və Allah bu əllərin xeyirini kəssin. Peyğəmbərin *(sallallahu aleyhi va əlihi va səlləm)* əli ilə bundan artıq etdiyini görmədim deyərək şəhadət barmağına işarə edir[54]. Bu məqama aid bizə bir neçə hədislər varid olmuşdur.

c). Bu məqama yalvarmaq və ya qorxu duası da deyilir.

---

[53] - əbu Davud, 1489-cu hədis, Albani səhihləşdirmişdir, "Sahihu sunəni əbi Davud", 1321-ci hədis.

[54] - Müslim, 874-cü hədis.

**Qaydası:** Əllərini qollarınla birlikdə tam olaraq qoltuğunun altı görünənədək göyə qaldırırsan. Bu məqamdan, əsasən, şiddətli qorxu anında, yəni: döyüşdə, şiddətli quraqlıq baş verərsə, yağışın yağması üçün və ya ən çətin anlarda istifadə olunur.

Ənəsdən *(radiyallahu anhu)* rəvayət olunur ki:

***"Peyğəmbər (sallallahu aleyhi va əlihi va səlləm) dua edərkən əllərini qaldırdı və mən onun qoltuğunun altını gördüm."*** [55]

Ənəs ibn Malikdən *(radiyallahu anhu)* belə rəvayət olunur:

***"Peyğəmbər (sallallahu aleyhi va əlihi va səlləm) əllərinin üst hissəsini göyə tutaraq yağış duası etdi."*** [56]

Bu hədisə görə bəzi qardaşlarımız zənn edirlər ki, dua edərkən əllərinin üstünü göyə, içini isə yerə tərəf tutmaq sünnədir. Lakin bütün hədisləri cəm etdikdən sonra, bu hədisin mənasını belə başa düşmək olar. Yəni Peyğəmbərimiz *(sallallahu aleyhi va əlihi va səlləm)* əllərini qolları ilə birlikdə o qədər göyə qaldırdı ki, hətta, əlləri arxaya əyildi və sanki əllərinin üstü göyə baxırdı.

Əksinə, Malik ibn Yəsardan *(radiyallahu anhu)* Peyğəmbərin *(sallallahu aleyhi va əlihi va səlləm)* belə dediyi rəvayət olunur:

***"Allahdan istədiyiniz zaman əllərinizin içi ilə istəyin, üstü ilə istəməyin."*** [57]

**Dua zamanı əlləri qaldırarkən yol verilən xətalar**

1. Dua zamanı əlləri qaldırarkən üstünü göyə, içini isə yerə tutmaq:
2. Əlləri göbəklə bərabər və ya daha da aşağı tutmaq;
3. Əlləri dua üçün qaldırmamışdan öncə, yaxud, sonra bir-birinə sürtmək və ya öpmək;
4. Namazdan sonra sağ əli başın üzərinə qoyaraq dua etmək;

---

[55]- Buxari, 6341-ci hədis.

[56]- Müslim, 896-cı hədis.

[57]- Əhməd; əbu Davud, Albani səhihləşdirmişdir.

Bu barədə bir zəif rəvayət vardır ki, Peyğəmbərdən *(sallallahu aleyhi va əlihi va səlləm)* olmadığı üçün ona istinad etmək mümkün deyildir.

Məlum olduğu kimi, qulun etdiyi hər bir ibadətin "Quranda" və ya Peyğəmbərimizin *(sallallahu aleyhi va əlihi va səlləm)* sünnəsində səhih əsası olmalıdır. Əks təqdirdə isə edilən hər bir əməl dində qəbul olunmazdır. Aydın olduğu kimi, fərz namazlarından sonra "Quran" və sünnədə varid olan bəzi ayə, zikr və dualar vardır ki, onları hər namazdan sonra oxumaq sünnədir və bunları etməyin nə qədər savablı bir iş olduğu heç kəsə gizli deyildir. Belə olduğu təqdirdə fərz namazlarından sonra "Quran" və səhih sünnədə varid olmayan artıq əməllərə ehtiyac qalmır. Əksinə Allah-təalanın bizə "Qurani-Kərim"də İslam dinini tamamladığını vəd verdiyi halda, sanki din tamamlanmamışdır kimi dinə yeni bir əməl gətirmək sayılır.

Bu barədə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Kim (dində) əmrimiz olmayan bir əməl edərsə, o əməl ondan qəbul olunmaz"*** [58]

Hətta, bəziləri fərz namazlarından sonra sünnədə varid olmayan bəzi əməllərdən elə bərk yapışmışdırlar ki, sanki, bunu tərk edərlərsə namazlarının batil olduğunu sanarlar. Lakin oxunulması buyurulan ayə, zikr və duaları tərk edər və bunun mahiyyətinə belə varmazlar.Fərz namazlarından sonra edilən bu əməllərə  dair səhih sünnədə varid olmayan bir neçə zəif hədislər vardır ki, onlara etimad etmək mümkün deyildir. Uzunçuluq olmasaydı, həmin hədislərin zəifliyini və qondarmalığını açıqlayardım. Lakin bir onu demək istəyirəm ki, əgər bu əməlləri Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* etmiş olsaydı, şübhəsiz ki, səhabələr bu işdə bizi qabaqlayardılar. Onu da qeyd etmək istəyirəm ki, fərz yox, nafilə namazlarından sonra camaat halında

---

[58]- Müslim, 4468-ci hədis.

olmadan əlləri qaldıraraq dua etmək barəsində Peyğəmbərdən *(sallallahu aleyhi va əlihi va səlləm)* bir neçə səhih hədislər varid olmuşdur ki, bu da nafilə namazlarından sonra əlləri qaldıraraq dua etməyin icazəli olduğuna dəlalət edir.

**5.** Namaz daxilində dua edərkən göyə baxmaq:

Ümumiyyətlə istər namaz daxilində əlləri qaldıraraq qunut tutarkən istərsə də namaz xaricində əlləri qaldıraraq dua edərkən ovucun içinə baxılır. Namaz daxilində dua edərkən göyə baxmağa gəldikdə isə, bütün alimlər namazın daxilində olarkən Peyğəmbərdən *(sallallahu aleyhi va əlihi va səlləm)* varid olan səhih hədislərə istinadən göyə baxmağın qadağan olduğu barəsində ittifaq etmişdirlər. Namazın xaricində dua edərkən göyə baxmaq barəsində isə bir neçə dəlillər vardır ki, bu da namaz xaricində dua edərkən göyə baxmağın şəriətdə icazəli olduğuna dəlalət edir.

Məlum olduğu kimi müsəlmanların ilk qibləsi Qüds şəhərindəki Əqsa məscidi idi. Lakin Peyğəmbərimiz *(sallallahu aleyhi va əlihi va səlləm)* qiblənin Məkkə şəhərindəki Kəbə məscidinin olmasını arzulayar və bunun üçün də göyə baxaraq dua edərdi. Allah-təala bu barədə ayə nazil edərək buyurur:

﴿قَدْ نَرَى تَقَلُّبَ وَجْهِكَ فِي السَّمَاء فَلَنُوَلِّيَنَّكَ قِبْلَةً تَرْضَاهَا فَوَلِّ وَجْهَكَ شَطْرَ الْمَسْجِدِ الْحَرَامِ وَحَيْثُ مَا كُنتُمْ فَوَلُّواْ وُجُوِهَكُمْ شَطْرَهُ وَإِنَّ الَّذِينَ أُوْتُواْ الْكِتَابَ لَيَعْلَمُونَ أَنَّهُ الْحَقُّ مِن رَّبِّهِمْ وَمَا اللّهُ بِغَافِلٍ عَمَّا يَعْمَلُونَ﴾

**"(Ya Rəsulum!) Biz sənin üzünün göyə tərəf çevrildiyini görürük, ona görə də səni razı olduğun qibləyə tərəf döndərəcəyik. İndi üzünü Məscidülhərama tərəf çevir! (Ey müsəlmanlar!) Harada olsanız (namaz vaxtı) üzünüzü oraya döndərin! Kitab verilmişlər bunun öz Rəbbi tərəfindən bir**

**həqiqət olduğunu yaxşı bilirlər. Allah onların əməllərindən xəbərsiz deyildir."** [59]

Həmçinin, bir neçə hədislərdə Peyğəmbərin *(sallallahu aleyhi va əlihi va səlləm)* dua edərkən göyə baxdığı varid olmuşdur.

**5. Duadan əvvəl Allah-təalaya həmd-səna etmək və Peyğəmbərə *(sallallahu aleyhi va əlihi va səlləm)* salavat gətirmək**

Əbu Hureyrədən *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

*"**Allah-təala buyurmuşdur: "Mən namazı Özümlə qulum arasında iki yerə bölmüşəm. Quluma istədiyini verərəm. Əgər qul Əlhəmdu lilləhi Rabbi-l-aləmin [Həmd olsun Allaha aləmlərin Rəbbinə] deyərsə, Allah-təala deyər: Qulum Mənə həmd etdi. Əgər ər-Rahməni-r-Rahim [Mərhəmətli və Rəhimli olana] deyərsə Allah-təala deyər: Qulum Məni tərif etdi. Əgər məliki yəumiddin [haqq-hesab gününün sahibinə] deyərsə, Allah-təala buyurar: Qulum Məni öyərək uca tutdu. Əgər iyyəkə nəabudu va iyyəkə nəstəin [Biz yalnız Sənə ibadət edirik və yalnız Səndən kömək diləyirik] deyərsə, Allah-təala deyər: Bu Mənimlə qulum arasındadır və quluma istədiyini verərəm. Əgər ihdinə-s-sırata-l mustəqim [bizi doğru yola yönəlt] deyərsə, Allah-təala deyər: Bu qulumundur və quluma istədiyini verdim. ""*** [60]

Hədisdən məlum olduğu kimi, Allah-təala bu əzəmətli surə ilə qullarının Ondan necə və hansı yolla dua edərək istəmələrini açıq-aydın bizə bəyan etmişdir.

İbn əl-Qayyim *(rahiməhullah)* demişdir: "Allahdan doğru yola yönəldərək hidayət etməsini istəmək, istənilənlərin ən üstünü və ona nail olmaq mükafatların ən qiymətlisi olduğu üçün Allah-təala öz qullarını Ondan necə dua edərək istəyəcəklərini öyrədərək

---

[59] -2) "əl-Bəqərə" - 144.

[60] - Müslim, 876-cı hədis

duadan əvvəl Ona həmd-səna etmələrini və şəninə təriflər deyərək uca tutmalarını əmr etmişdir."

Həmçinin, Fudala ibn Ubeyd *(radiyallahu anhu)* rəvayət edir:

"***Peyğəmbər* (sallallahu aleyhi va əlihi va səlləm) *oturmuşdu. Bir kişi daxil olaraq namaz qılmağa başladı və dedi: - Allahım, məni bağışla və mənə rəhm et. Peyğəmbər* (sallallahu aleyhi va əlihi va səlləm) *dedi: "Ey namaz qılan, tələsdin. Namaz qılıb oturduqdan sonra, Allaha layiqincə həmd et, mənə salavat de, sonra Allaha dua et." Ondan sonra başqa bir kişi namaz qılır, Allaha həmd edərək Peyğəmbərə* (sallallahu aleyhi va əlihi va səlləm) *salavat gətirir və Peyğəmbər* (sallallahu aleyhi va əlihi va səlləm)*ona belə deyir: "Ey namaz qılan, dua et, duan qəbul olar."***[61]

Dua əsnasında Peyğəmbərə *(sallallahu aleyhi va əlihi va səlləm)* salavat gətirmək üç cür olur:

1. Dua etməzdən əvvəl Allaha həmd-səna etdikdən sonra salavat demək;
2. Duanın əvvəlində, ortasında və sonunda salavat demək;
3. Duadan əvvəl və sonra salavat demək;

Dua edərkən Peyğəmbərə *(sallallahu aleyhi va əlihi va səlləm)* salavat demək açara bənzəyir. İbn əl-Qayyim *(rahiməhullah)* demişdir: "Namazın açarı dəstəmaz olduğu kimi, duanın da açarı Peyğəmbərə *(sallallahu aleyhi va əlihi va səlləm)* salavat deməkdir."[62]

### 6. İnsanın dua edərkən günahkar olduğunu etiraf etməsi

Ona görə də, Yunis peyğəmbərin *(aleyhissələm)* etdiyi dua ən böyük dualardan biri sayılır.

Allah-təala Yunis *(aleyhissələm)* haqqında belə buyurmuşdur:

---

61 - Tirmizi, 3476-cı hədis. Albani səhihləşdirmişdir. "Sahihu-l-cəmi", 3988-ci hədis.

62- Cələu-l-əfhəm, səh:260.

﴿وَذَا النُّونِ إِذ ذَّهَبَ مُغَاضِبًا فَظَنَّ أَن لَّن نَّقْدِرَ عَلَيْهِ فَنَادَى فِي الظُّلُمَاتِ أَن لَّا إِلَهَ إِلَّا أَنتَ سُبْحَانَكَ إِنِّي كُنتُ مِنَ الظَّالِمِينَ. فَاسْتَجَبْنَا لَهُ وَنَجَّيْنَاهُ مِنَ الْغَمِّ وَكَذَلِكَ نُنجِي الْمُؤْمِنِينَ﴾

**“Zün-nunu [balıq sahibi Yunisi] xatırla. Bir zaman o [küfr etməkdə həddi aşmış, ümmətinə qarşı] qəzəblənərək çıxıb getmiş və [Bizə xoş gəlməyən bu səbirsizliyinə görə] onu möhnətə düçar etməyəcəyimizi güman etmişdi. Amma sonra, qaranlıqlar içində [balığın qarnında, gecənin, yaxud, dənizin zülmətində] “(Allahım,) Səndən başqa ibadətə haqqı olan məbud yoxdur. Sən pak və müqəddəssən. Mən isə, həqiqətən zalimlərdən olmuşam, [Əmrinə qarşı çıxaraq özümə zülm etmişəm]!” - deyib dua etmişdi. Biz onun duasını qəbul buyurduq və (balığın qarnından çıxartmaqla) onu qəmdən qurtardıq. Biz möminlərə belə nicat verərik!”**[63].

Həmçinin, “Seyyidu-l-istiğfar” adlanan dua günahların bağışlanması üçün edilən ən üstün və fəzilətli dualardandır. Çünki qul bu duada özünün günahkar və xatakar olduğunu təsdiq edir.

Şəddad ibn Ovsdan *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***“Seyyidu-l-istiğfar” [bağışlanma diləməyin (ağası) ən üstünü] qulun belə söyləməsidir: “Allahummə, əntə rabbi lə iləhə illə əntə, xalaqtəni va ənə abdukə va ənə alə ahdikə va vadikə mə-stətatu, əuzu bikə min şərri mə sanatu. Əbuu ləkə bi nimətikə aleyyə əbuu bi zənbi fəğfirli fəinnəhu lə yağfiru-z-zunubə illə əntə.” “Allahım! Sən mənim Rəbbimsən. Səndən başqa ibadət olunmağa haqqı olan məbud yoxdur. Məni Sən yaratdın. Mən Sənin qulunam. Gücüm yetdiyi qədər Sənə verdiyim əhd və vədə sadiqəm. Etdiklərimin şərindən Sənə sığınıram. Mənə verdiyin nemətini etiraf edir və günahımı boynuma alıram. Məni bağışla, şübhəsiz ki, Səndən başqa günahları bağışlayan yoxdur.”***

[63]-21)- “əl-Ənbiyə” - 87-88.

*Kim bunu yəqinliklə iman edərək səhər deyər və həmin gün axşamlamamışdan öncə dünyasını dəyişərsə, Cənnət əhlindən olar. (Həmçinin,) Kim bunu yəqinliklə iman edərək axşam deyərsə və sabahlamamışdan öncə dünyasını dəyişərsə, Cənnət əhlindən olar."*[64]

**7. Dua edənin məqsədinin yaxşı olması**

Yəni insan dua edərkən əgər Allah-təala onun duasını qəbul edərsə həmin duadan doğan səmərəni xeyirli işdə sərf edəcəyinə niyyət etməlidir.

Məsələn: "Allahım, mənə mal-dövlət ver İslam dininin güclənməsinə və kasıblara kömək edim." Yaxud "Allahım, mənə ismətli olmaq üçün, günahlardan qorunmaq üçün əməli-saleh zövcə nəsib et" və s.

Buna dəlil Allah-təalanın Musa (aleyhissəlləm) haqqında söylədiyi ayədir:

﴿قَالَ رَبِّ اشْرَحْ لِي صَدْرِي. وَيَسِّرْ لِي أَمْرِي. وَاحْلُلْ عُقْدَةً مِّن لِّسَانِي يَفْقَهُوا قَوْلِي. وَاجْعَل لِّي وَزِيرًا مِّنْ أَهْلِي. هَارُونَ أَخِي. اشْدُدْ بِهِ أَزْرِي. وَأَشْرِكْهُ فِي أَمْرِي. كَيْ نُسَبِّحَكَ كَثِيرًا. وَنَذْكُرَكَ كَثِيرًا. إِنَّكَ كُنتَ بِنَا بَصِيرًا﴾

**"(Musa) dedi: "Ey Rəbbim! (Peyğəmbərliyi yerinə yetirməyə qadir olmaq, Fironla danışmağa cürət etmək və bu yolda bütün məşəqqətlərə tab gətirə bilmək üçün) köksümü açıb genişlət; İşimi yüngülləşdir; Dilimdəki düyünü aç (pəltəkliyimi götür) ki, Sözümü yaxşı anlasınlar! Və mənə öz ailəmdən bir vəzir (köməkçi) ver Qardaşım Harunu! Onunla arxamı möhkəmləndir. Onu işimə ortaq et (ona da peyğəmbərlik ver) ki, Səni çox təqdis**

[64] - Buxari, 6306-cı hədis.

**edib şəninə təriflər deyək. Və Səni çox zikr edək (daim yada salıb şükr-səna edək). Sən, şübhəsiz ki, Bizi görürsən!"**[65]

Nəticəsi nə oldu? Allah-təala buyurdu:

﴿قَالَ قَدْ أُوتِيتَ سُؤْلَكَ يَا مُوسَى﴾

**"(Allah) buyurdu: "Dilədiyin sənə verildi, ya Musa!"**[66]

Həmçinin, Abdullah ibn Ömərdən (radiyallahu anhumə) rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Bir kişi xəstə ziyarət edərkən belə desin; "Qulun filana... namaza gedə bilməsi üçün şəfa ver"***[67]

**8. Dua edərkən ağlamaq**

Abdullah ibn Amr ibn əl-Asdan (radiyallahu anhumə) rəvayət olunur ki;

***Peyğəmbər (sallallahu aleyhi va əlihi va səlləm) Allahın İbrahim Peyğəmbər (aleyhissələm) barəsində buyurduğu bu kəlamını:***

﴿رَبِّ إِنَّهُنَّ أَضْلَلْنَ كَثِيرًا مِّنَ النَّاسِ فَمَن تَبِعَنِي فَإِنَّهُ مِنِّي وَمَنْ عَصَانِي فَإِنَّكَ غَفُورٌ رَّحِيمٌ﴾

**"Ey Rəbbim! Onlar həqiqətən, çox insanı (haqq yoldan) azdırıblar. İndi kim arxamca gəlsə, o, şübhəsiz ki, məndəndir. Kim mənə qarşı çıxsa, (bilsin ki, tövbə edəcəyi təqdirdə) Sən (günahları) bağışlayansan, (bəndələrinə) rəhm edənsən!"**[68]

***Və İsa Peyğəmbərin (aleyhissələm) bu kəlamını:***

﴿إِن تُعَذِّبْهُمْ فَإِنَّهُمْ عِبَادُكَ وَإِن تَغْفِرْ لَهُمْ فَإِنَّكَ أَنتَ الْعَزِيزُ الْحَكِيمُ﴾

**"Əgər onlara əzab versən, şübhə yoxdur ki, onlar Sənin qullarındır. Əgər onları bağışlasan, yenə şübhə yoxdur ki, Sən**

---

65 - 20) "Taha" - 25 - 35.

66 - 20) "Taha" - 35.

67 - əbu Davud, 3107, Albani səhihləşdirmişdir, "Sahihu-l-cəmi", 466.

68 - 14) "İbrahim" - 36.

**yenilməz qüvvət sahibi, hikmət sahibisən" (İstədiyin bəndəyə əzab verməyə, istədiyini bağışlamağa və hər hansı bir məsələni hakimanə həll etməyə qadir olan ancaq Sənsən!)"**[69] - *oxuyaraq, əllərini qaldırıb dedi; "Allahım, ümmətim, ümmətim!" və ağlamağa başladı. Allah-təala daha yaxşı bildiyi halda dedi; "Ey Cəbrayıl, Məhəmmədin yanına get və soruş ki, səni ağladan nədir?"*

*Cəbrayıl onun yanına gedərək soruşur və Peyğəmbər (sallallahu aleyhi va əlihi va səlləm) ona dediklərini - Allah-təala bildiyi halda - xəbər verir.*

*Allah-təala deyir; "Ey Cəbrayıl, Məhəmmədin yanına gedərək de ki, Biz səni ümmətin üçün istədiyin şeydə razı salacağıq və səni pərişan etmərik."*[70]

**9. Dua edənin çətinlikdə və ehtiyaclı olmasını Allaha bildirməsi**

Allah-təala Əyyub *(aleyhissələm)* haqqında belə buyurmuşdur:

﴿وَأَيُّوبَ إِذْ نَادَى رَبَّهُ أَنِّي مَسَّنِيَ الضُّرُّ وَأَنتَ أَرْحَمُ الرَّاحِمِينَ﴾

**"(Ya Rəsulum!) Əyyubu da (yada sal)! Bir vaxt o, Rəbbinə yalvarıb dua edərək belə demişdi: "Mənə bəla üz verdi (Sənə pənah gətirdim). Sən rəhmlilərin rəhmlisisən!"**[71]

Zəkəriyya *(aleyhissələm)* haqqında belə buyurmuşdur:

﴿وَزَكَرِيَّا إِذْ نَادَى رَبَّهُ رَبِّ لَا تَذَرْنِي فَرْدًا وَأَنتَ خَيْرُ الْوَارِثِينَ. فَاسْتَجَبْنَا لَهُ وَوَهَبْنَا لَهُ يَحْيَى وَأَصْلَحْنَا لَهُ زَوْجَهُ إِنَّهُمْ كَانُوا يُسَارِعُونَ فِي الْخَيْرَاتِ وَيَدْعُونَنَا رَغَبًا وَرَهَبًا وَكَانُوا لَنَا خَاشِعِينَ﴾

---

[69] - 5) "əl-Maidə" - 118.

[70] - Muslim, 202.

[71] - 21) "əl-Ənbiyə" - 83.

**“(Ya Rəsulum!) Zəkəriyyanı da (yada sal)! Bir vaxt o: “Ey Rəbbim! Məni tək (kimsəsiz, varissiz) buraxma. Sən varislərin ən yaxşısısan! (Bütün məxluqat yox olar, ancaq Sən qalarsan!)” – deyə yalvarıb Rəbbinə dua etmişdi.**

**Biz (Zəkəriyyanın) duasını qəbul buyurduq, ona Yəhyanı bəxş etdik və zövcəsini (dünyaya uşaq gətirməyə) qabil bir hala gətirdik. Onlar xeyirli işlər görməyə tələsər (yaxşı əməllər etməkdə bir-birini ötməyə çalışar), ümid və qorxu ilə (rəhmətimizə ümid bəsləyib əzabımızdan qorxaraq) Bizə ibadət edirdilər. Onlar Bizə müti idilər.”[72]**

Yəqub *(aleyhissələm)* haqqında belə buyurmuşdur:

﴿قَالَ إِنَّمَا أَشْكُو بَثِّي وَحُزْنِي إِلَى اللَّهِ﴾

**“(Yəqub) belə cavab verdi: “Mən dərd-sərimi yalnız Allaha ərz edirəm”[73]**

Musa *(aleyhissələm)* haqqında belə buyurmuşdur:

﴿فَقَالَ رَبِّ إِنِّي لِمَا أَنزَلْتَ إِلَيَّ مِنْ خَيْرٍ فَقِيرٌ﴾

**“(Musa) dedi: “Ey Rəbbim! Mən Sənin mənə nazil edəcəyin xeyirə möhtacam!” (Musa yeddi gün idi ki, çöldəki otlardan başqa yeməyə bir şey tapmırdı. Buna görə də Allahdan yemək üçün bir ruzi dilədi).”[74]**

**10. Duanın qısa, lakin çox mənalı və gözəl kəlmələrlə olması**

Edilən dua uzunçuluqdan, lazımsız və artıq kəlmələrdən uzaq olmalıdır. Aişədən *(radiyallahu anhu)* rəvayət olunur ki:

***“Peyğəmbər (sallallahu aleyhi va əlihi va səlləm) qısa və çox mənalı olan duanı sevər və ondan qeyrilərini tərk edərdi.”[75]***

---

[72] - 21) “əl-Ənbiyə” - 89 - 90.

[73] - 12) “Yusuf” - 86.

[74] - 28) “əl-Qasas” - 24.

[75] - əbu Davud, 5/1452.

**11. Dua edənin ən birinci özündən başlaması**

Ubeyy ibn Kaabdan *(radiyallahu anhu)* rəvayət olunur ki;

***"Peyğəmbər (sallallahu aleyhi va əlihi va səlləm) bir kəsi xatırlayıb ona dua etmək istədiyi zaman özündən başlayardı."[76]***

Dua edənin özündən başlaması haqqında "Qurani-Kərim"də çox yerlərdə varid olmuşdur. Necə ki, Allah-təala səhabələrdən sonra gələnlər barəsində buyurmuşdur:

﴿وَالَّذِينَ جَاؤُوا مِن بَعْدِهِمْ يَقُولُونَ رَبَّنَا اغْفِرْ لَنَا وَلِإِخْوَانِنَا الَّذِينَ سَبَقُونَا بِالْإِيمَانِ وَلَا تَجْعَلْ فِي قُلُوبِنَا غِلًّا لِّلَّذِينَ آمَنُوا رَبَّنَا إِنَّكَ رَؤُوفٌ رَّحِيمٌ﴾

**"Onlardan (mühacirlərdən və ənsarlardan) sonra gələnlər (tabeinlər) belə deyərlər: "Ey Rəbbimiz! Bizi və bizdən əvvəlki iman gətirmiş (din) qardaşlarımızı bağışla. Bizim qəlblərimizdə iman gətirənlərə qarşı kinə (həsədə) yer vermə. Ey Rəbbimiz! Sən, həqiqətən, şəfqətlisən, mərhəmətlisən!"[77]**

Əgər insan özü və başqaları üçün dua etmək istəyirsə ən birinci özündən başlamalı, yalnız başqası üçün dua etmək istəyirsə özünə dua etmədən ona etdiyi dua ilə kifayətlənə bilər.

Necə ki, keçən hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* özünə dua etmədən Ubeyd Əbu Amirə dua etdi.

**12. Duanı bir neçə dəfə təkrar etmək**

Abdullah ibn Məsuddan rəvayət olunur ki;

***"Peyğəmbər (sallallahu aleyhi va əlihi va səlləm) üç dəfə dua və üç dəfə istiğfar etməyi xoşlayardı."[78]***

---

[76] - Əbu Davud,3984, Albani səhihləşdirmişdir. "Sahihu-l-cəmi", 4723.

[77] - 59) "əl-Həşr" - 10.

[78] - Əbu Davud, 1524.

**13. Davamlı olaraq hər bir zaman dua etmək**

Dua etməyin mühüm ədəblərindən biri də duanı yalnız çətin hallarda deyil, hər bir zaman, yəni sağlam, varlı, xoşbəxt və s. olarkən etməkdir. Çünki şən və xoş anlarda dua etmək çətinlik və müsibətlərdə edilən duanın qəbul olmasına səbəb olur. Əbu Hureyrədən rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur;

***"Kim Allah-təalanın onun duasını şiddətli və çətinlik anında qəbul etməsini istəyirsə xoş anlarında çoxlu dua etsin."***[79]

Lakin müşriklər yalnız çətin anlarında Allah-təalaya üz tutaraq dua edər, xoş anlarında isə Allahı unudaraq onlara nə bir xeyir verə bilən, nə də bir zərər verə bilməyən daşlara, ağaclara və s. yalvararaq kömək istəyərdilər.

Allah-təala onlar barəsində buyurmuşdur:

﴿وَإِذَا مَسَّ الْإِنسَانَ ضُرٌّ دَعَا رَبَّهُ مُنِيبًا إِلَيْهِ ثُمَّ إِذَا خَوَّلَهُ نِعْمَةً مِّنْهُ نَسِيَ مَا كَانَ يَدْعُو إِلَيْهِ مِن قَبْلُ وَجَعَلَ لِلَّهِ أَندَادًا لِّيُضِلَّ عَن سَبِيلِهِ قُلْ تَمَتَّعْ بِكُفْرِكَ قَلِيلًا إِنَّكَ مِنْ أَصْحَابِ النَّارِ﴾

**"İnsana bir zərər toxunduqda tövbə edərək Rəbbinə yalvarar. Sonra (Allah Öz) dərgahından ona bir nemət əta etsə, əvvəlcə kimə dua etmiş olduğunu unudar və (xalqı) Allah yolundan (islam dinindən) çıxartmaq üçün Ona şəriklər qoşar. (Ey Peyğəmbər! Ona) De: "Hələ küfrünlə bir müddət dövran sür. Şübhəsiz ki, sən cəhənnəm əhlindənsən!"**[80]

Həmçinin Allah-təala xoş, gözəl və əmin-amanlıq anlarında Onu unudaraq mal-dövlətinə, cah-cəlalına, vəzifəsinə və s. arxayın olub çətinlik və bədbəxtlik üz verən zaman isə Onu ötəri yad edənlər barəsində buyurmuşdur:

﴿وَإِذَا أَنْعَمْنَا عَلَى الْإِنسَانِ أَعْرَضَ وَنَأَى بِجَانِبِهِ وَإِذَا مَسَّهُ الشَّرُّ فَذُو دُعَاءٍ عَرِيضٍ﴾

---

[79] - Tirmizi, 3382; Albani həsənləşdirmişdir. "Sahihu-l-cəmi" 6290.

[80] - 39) "əz-Zumər" - 8.

**"İnsana nemət bəxş etdiyimiz zaman (imandan) üz döndərərək təkəbbürlük edər. Ona bir pislik üz verdikdə isə (Rəbbinə) uzun-uzadı dua edər (yaxşı gündə Allahı unudar, dar gündə dərhal Ona yalvarar)."**[81]

Həmçinin, buyurmuşdur:

﴿فَإِذَا مَسَّ الْإِنسَانَ ضُرٌّ دَعَانَا ثُمَّ إِذَا خَوَّلْنَاهُ نِعْمَةً مِّنَّا قَالَ إِنَّمَا أُوتِيتُهُ عَلَى عِلْمٍ بَلْ هِيَ فِتْنَةٌ وَلَكِنَّ أَكْثَرَهُمْ لَا يَعْلَمُونَ. قَدْ قَالَهَا الَّذِينَ مِن قَبْلِهِمْ فَمَا أَغْنَى عَنْهُم مَّا كَانُوا يَكْسِبُونَ﴾

**"İnsana bir zərər toxunduğu (sıxıntı üz verdiyi) zaman Bizə dua edər. Sonra dərgahımızdan ona bir nemət əta etdikdə: "Bu mənə yalnız biliyimə (ticarətdən, qazanc işlərindən başım çıxdığına) görə verilmişdir!" - deyər. Xeyr, bu bir imtahandır, lakin onların (insanların) əksəriyyəti (cahilliyi üzündən bunu) bilməz!**

**Şübhəsiz ki, bu sözü onlardan əvvəlkilər (keçmiş ümmətlər) də demişdilər. Lakin qazandıqları (dünya malı) onlara heç bir fayda vermədi (əzabı onlardan dəf edə bilmədi)."**[82]

Başqa bir ayədə isə buyurmuşdur:

﴿وَإِذَا مَسَّ الإِنسَانَ الضُّرُّ دَعَانَا لِجَنبِهِ أَوْ قَاعِدًا أَوْ قَآئِمًا فَلَمَّا كَشَفْنَا عَنْهُ ضُرَّهُ مَرَّ كَأَن لَّمْ يَدْعُنَا إِلَى ضُرٍّ مَّسَّهُ كَذَلِكَ زُيِّنَ لِلْمُسْرِفِينَ مَا كَانُواْ يَعْمَلُونَ﴾

**"İnsana bir sıxıntı (xəstəlik, yoxsulluq, bəla) üz verən zaman uzananda da, oturanda da, ayaq üstə duranda da Bizə dua edər. Lakin onu sıxıntıdan qurtardıqda ondan ötrü (əvvəlcə) Bizə heç dua etməmiş kimi çıxıb gedər. (Allaha şükür etməyi də unudub yaramaz işlərində davam edər). Həddi aşanlara etdikləri əməllər beləcə yaxşı göstərildi."**[83]

---

[81] - 41) "Fussilət" - 51.

[82] - 39) "əz-Zümər" - 49-50.

[83] - 10) "Yunus" - 12.

Abdullah ibn Abbasdan rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* ona buyurmuşdur:

***"Allahı xoş anında (ibadət, dua və s. edərək) tanı ki, Allah da səni çətin anında tanısın."*** [84]

Dahhək *(rahiməhullah)* demişdir: "Allah-təalanı xoş anlarınızda xatırlayın ki, O da sizi çətin anlarınızda xatırlasın. Necə ki, Yunus (aleyhissəlləm) Allahı xoş anlarında Ona ibadət edərək və s. xatırlayardı. O vaxt ki, balıq onu uddu Allah-təala onu balığın qarnından sağ-salamat xilas edərək belə buyurdu:

﴿فَلَوْلَا أَنَّهُ كَانَ مِنْ الْمُسَبِّحِينَ. لَلَبِثَ فِي بَطْنِهِ إِلَى يَوْمِ يُبْعَثُونَ﴾

**"Əgər o, (Allahı) çox təqdis edənlərdən (namaz qılanlardan) olmasaydı,**

**Yəqin ki, balığın qarnında qiyamət gününə qədər qalardı."**[85]

Həmçinin Firon yer üzündə fitnə-fəsad törədər və Allaha ibadət etməyərək Onu xatırlamağı unutmuşdu. O vaxt ki, dənizdə boğulmağa başladı dedi: "İndi Allaha iman etdim" Lakin Allah-təala onun imanını qəbul etməyərək belə buyurur:

﴿آلْآنَ وَقَدْ عَصَيْتَ قَبْلُ وَكُنتَ مِنَ الْمُفْسِدِينَ﴾

**"İndimi? (Ölüm qabağı, bütün var-dövlətin, hakimiyyətin əlindən çıxdıqdan sonramı iman gətirirsən?) Halbuki əvvəlcə (Allaha) qarşı çıxmış və fitnə-fəsad törədənlərdən olmuşdun!"**[86]

Kim Allahı xoş və firavan günlərində tanımazsa Allah-təala da onu ağır günlərində nə dünyada nə də ki, axirətdə tanımaz"[87]

Əbu Dərda *(radiyallahu anhu)* demişdir; "Şən günlərində Allaha dua et ki, O da sənin duanı çətin günlərində qəbul etsin."[88]

---

[84] - Əhməd, 1/293, Albani səhihləşdirmişdir, "Sahihu-l-cəmi" 2961.

[85] - 37) "əs-Saffat" - 143-144.

[86] -10) "Yunus" - 91.

[87] - İbn Rəcəb, "Nuru-l-iqtibəs", səh. 43.

[88] - "Musannəfu Abdi-r-Razzəq", 11/180.

### 14. Sevgi, qorxu və ümid ilə yalvararaq dua etmək

Allah-təala öz peyğəmbərlərini öyərək belə demişdir:

﴿فَاسْتَجَبْنَا لَهُ وَوَهَبْنَا لَهُ يَحْيَى وَأَصْلَحْنَا لَهُ زَوْجَهُ إِنَّهُمْ كَانُوا يُسَارِعُونَ فِي الْخَيْرَاتِ وَيَدْعُونَنَا رَغَبًا وَرَهَبًا وَكَانُوا لَنَا خَاشِعِينَ﴾

**“Biz (Zəkəriyyanın) duasını qəbul buyurduq, ona Yəhyanı bəxş etdik və zövcəsini (dünyaya uşaq gətirməyə) qabil bir hala gətirdik. Onlar xeyirli işlər görməyə tələsər (yaxşı əməllər etməkdə bir-birini ötməyə çalışar), ümid və qorxu ilə (rəhmətimizə ümid bəsləyib əzabımızdan qorxaraq) Bizə dua edirdilər. Onlar Bizə müti idilər.”** [89]

Həmçinin mömin qullarını öyərək buyurmuşdur:

﴿تَتَجَافَى جُنُوبُهُمْ عَنِ الْمَضَاجِعِ يَدْعُونَ رَبَّهُمْ خَوْفًا وَطَمَعًا وَمِمَّا رَزَقْنَاهُمْ يُنفِقُونَ﴾

**“Onlar ibadət üçün yataqlarından qalxar (gecələr az yatar), qorxu və ümid içində (Allahın əzabından qorxaraq, mərhəmətinə ümid bəsləyərək) Rəbbinə dua edər və onlara verdiyimiz ruzilərdən (ehtiyacı olanlara) sərf edərlər.”** [90]

### 15. Dua edərkən əzm edərək qətiyyətlə istəmək

Yəni dua edərkən “Allahım, istəyirsən məni bağışla”, yaxud “Allahım, istəyirsən mənə rəhm et” deməməlidir. Əksinə qətiyyətlə “Allahım, məni bağışla və mənə rəhm et” deməlidir. Əbu Hureyrədən *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***“Heç kəs “Allahım, istəyirsən məni bağışla”, “Allahım, istərsən mənə rəhm et” deməsin. İstədiyini əzm (qətiyyətlə) etsin. Çünki Allahı məcbur edən yoxdur.”*** [91]

---

[89] - 21) “əl-Ənbiyə” - 90.
[90] - 32) “əs-Səcdə” - 16.
[91] -Buxari, 6339; müslim, 2678.

Bəziləri zənn edirlər ki, Allah –təalaya duada "et" deyib müraciət etmək Allaha əmr vermək olduğu üçün ədəbsizlik sayılır. Lakin bu heç də belə deyildir. Çünki bəzən yuxarı təbəqənin aşağı təbəqəyə "et" deyə müraciət etməsi əmr, aşağı təbəqənin yuxarı təbəqəyə "et" deyə müraciət etməsi isə xahiş sayılır.

**16. Müsəlmanlar üçün dua etmək**

Dua edərkən mühüm məsələlərdən biri də, başqa müsəlmanlar üçün dua etməkdir. Şübhəsiz ki, hər kəs başqasının onun üçün dua etməsini istəyir və buna sevinir. Həmçinin, müsəlman özü üçün istədiyi xeyri başqaları üçün də istəməlidir. Kim belə edərsə, Allah-təala onun üçün müsəlman qardaşlarının dua etməsinə kömək olar.

Əbu Dərdadan *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Müsəlman bir kişinin öz (müsəlman) qardaşı üçün onun xəbəri olmadan gizlicə etdiyi duası qəbuldur. Onun (dua edənin) başı üzərində bir mələk vardır ki, hər dəfə qardaşı üçün xeyir dua etdiyi zaman ona vəkil olunmuş mələk deyər: "Amin və sənə də onun mislində."*** [92]

Nəvəvi *(rahiməhullah)* bu hədisin şərhində belə demişdir: "...Sələflərdən bəziləri özü üçün dua etmək istədiyi zaman həmin duanı müsəlman qardaşı üçün edərdi. Çünki insanın müsəlman qardaşı üçün gizlicə etdiyi duası hədisdə göstərildiyi kimi həm öz duasının, həm də başqası üçün etdiyi duanın qəbul olmasına səbəb olur."[93]

Əgər insan müsəlmanların halına baxarsa, onların müxtəlif çətinliklərdə olduqlarını görər. Şübhəsiz ki, hər bir çətinlikdə olanın müsəlman qardaşlarının onun üçün xeyir-dua etməsinə

---

92 - Müslim, 2732-ci hədis.
93 - "Şərhu sahihi Muslim", 17/51.

ehtiyacı vardır. Müsəlmanlardan elələri də vardır ki, fitnə-fəsad və döyüş içərisində yaşayırlar. Artıq düşmənləri onları məğlub etmiş, haqsız yerə qanlarını axıtmışlar. Qadınlarını ərsiz, uşaqlarını yetim qoymuş və mallarını əllərindən almışlar. Müsəlman ümmətinin haqsız yerə zülm olunmaları hər bir müsəlmanı kədərləndirməli və narahat etməlidir.

Necə ki, Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Möminlərin bir-birinə olan sevgisinin, rəhmətinin və şəfqətinin misalı bir cəsədə bənzəyir. Əgər cəsəddən bir üzv ağrılardan şikayət edərsə digər üzvləri yuxusuzluq və qızdırma ilə narahat olar."***[94]

Ona görə də hər bir iman sahibi müsəlman qardaş və bacılarının çəkdikləri ağrılara şərik olmalı və Allahdan səmimi qəlblə onların qəm-kədərlərinin yox olmasını, düşmənlərinin məğlub edilməsini və aralarında əmin-amanlığın bərqərar olmasını istəməlidir. Necə ki, Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* müsəlmanlara bir müsibət baş verdiyi zaman qunut tutar, onlar üçün Allahdan kömək, düşmənləri üçün isə həlak və məğlubiyyət diləyərdi.

**17. Müsəlman kişi və qadınlar üçün bağışlanma diləmək**

Allah-təala Məhəmməd Peyğəmbərə *(sallallahu aleyhi va əlihi va səlləm)* əmr edərək belə buyurmuşdur:

﴿فَاعْلَمْ أَنَّهُ لَا إِلَهَ إِلَّا اللَّهُ وَاسْتَغْفِرْ لِذَنبِكَ وَلِلْمُؤْمِنِينَ وَالْمُؤْمِنَاتِ وَاللَّهُ يَعْلَمُ مُتَقَلَّبَكُمْ وَمَثْوَاكُمْ﴾

**"(Ya Rəsulum!) Bil ki, Allahdan başqa heç bir tanrı yoxdur. (Ondan) həm öz günahlarının, həm də mömin kişilərin və qadınların bağışlanmasını dilə. Allah gəzib-dolandığınız yeri də, dayanıb-duracağınız yeri də bilir! "** [95]

Nuh Peyğəmbərin *(aleyhi-s-səlləm)* belə dediyini buyurmuşdur:

---

[94] -Buxari,5665- ci hədis, Müslim, 2586- cı hədis.

[95] -47)- "Məhəmməd" - 19

﴿رَبِّ اغْفِرْ لِي وَلِوَالِدَيَّ وَلِمَن دَخَلَ بَيْتِيَ مُؤْمِنًا وَلِلْمُؤْمِنِينَ وَالْمُؤْمِنَاتِ وَلَا تَزِدِ الظَّالِمِينَ إِلَّا تَبَارًا﴾

**"Ey Rəbbim! Məni, ata-anamı, mənim evimə (yaxud məscidimə) mömin kimi daxil olan kimsəni və (Qiyamət gününə qədər olacaq) bütün mömin kişiləri və qadınları bağışla. Zalımların isə ancaq və ancaq həlakını (ölümünü) artır!"** [96]

Həmçinin, səhabələrdən sonra gələn möminləri öyərək belə buyurmuşdur:

﴿وَالَّذِينَ جَاؤُوا مِن بَعْدِهِمْ يَقُولُونَ رَبَّنَا اغْفِرْ لَنَا وَلِإِخْوَانِنَا الَّذِينَ سَبَقُونَا بِالْإِيمَانِ وَلَا تَجْعَلْ فِي قُلُوبِنَا غِلًّا لِّلَّذِينَ آمَنُوا رَبَّنَا إِنَّكَ رَؤُوفٌ رَّحِيمٌ﴾

**"Onlardan (Mühacirlərdən və Ənsarlardan) sonra gələnlər (tabiin) belə deyirlər: "Ey Rəbbimiz! Bizi və bizdən əvvəlki iman gətirmiş (din) qardaşlarımızı bağışla. Bizim qəlblərimizdə iman gətirənlərə qarşı kinə (həsədə) yer vermə. Ey Rəbbimiz! Sən, həqiqətən, şəfqətlisən, mərhəmətlisən! ""** [97]

Ubadə ibn əs-Samitdən *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Kim mömin kişi və qadınlar üçün bağışlanma diləyərsə, ona hər bir mömin kişi və qadının sayı qədər savab yazılar"***[98]

Hədisdən aydın olur ki, müsəlmanlar üçün bağışlanma diləməyin nəinki bağışlanma dilənənlərə, hətta, diləyənə belə böyük savabı vardır. Şübhəsiz ki, keçmiş və gələcək mömin kişi və qadınların sayının çoxluğu bizə məlumdur və onların dəqiq sayını Allahdan başqa heç kəs bilməz. Bu duanın əcrinin həddindən artıq böyük olduğuna görə keçən ayələrdə gördüyümüz kimi

---

[96] -71)- "Nuh" - 28

[97] -59)- "Həşr surəsi" - 10

[98] - Albani həsənləşdirmişdir, "Sahihu-l-cəmi", 6026-cı hədis.

Peyğəmbərlər və saleh insanlar belə dua etməyi heç vaxt tərk etməmişlər.

Əhməd ibn Dahhəkin belə dediyi rəvayət edilmişdir:

“Yuxumda Şureyh ibn Yunisi gördüm və ona dedim: “Rəbbin sənə nə etdi, ey Əbu Haris?” Dedi: “Məni bağışladı və qəsrimi Məhəmməd ibn Bəşirin qəsrinin yanında etdi.” Dedim: “Ey Əbu Haris, sən Məhəmməd ibn Bəşirdən çox üstünsən axı?” Dedi: “Elə demə! Həqiqətən, Allah-təala Məhəmməd ibn Bəşir üçün hər bir mömin kişi və qadının əməlindən pay hazırlamışdır. Çünki o, dua etdiyi zaman Allahım, mömin və müsəlman kişi və qadınları bağışla” deyərdi.” [99]

Allah-təaladan bütün müsəlmanların günahlarının bağışlamasını diləyirəm.

**18. Möminlərə tənə və lənət etməkdən uzaq olmaq**

Artıq bizə keçən ayə və hədislərdən möminlər üçün bağışlanma, rəhmət, qüvvət, əmin-amanlıq və s. diləməyin həm diləyənə həm də dilənənə dünyada və axirətdə nail olacağı fəzilətin, savabın və başqaları üçün dua etməklə öz duasının qəbul olacağına səbəb olması aydın oldu. Şübhəsiz ki, belə bir saleh əməlin müsəlmanlar arasında yayılması onların bir-birinə olan sevgisinə, yaxınlığına, bağlılığına və s. dəlildir. Həqiqətən də müsəlman daima müsəlman qardaş və bacıları üçün xoşbəxtlik, hidayət və xeyir istəməli, onlara qarşı rəhmli və mərhəmətli olmalıdır. Əgər kim bu sifətlərə nail olarsa, şübhəsiz ki, o, Qiyamət günü insanlara şahid və şəfaətçi olmağa layiq olar.

Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***“Tənəçi və lənətcil insanlar Qiyamət günü şahid və şəfaətçi olmazlar.”*** [100]

---

[99] - əbu Nueym, “Hilyətu-l-övliyə”, 15/113.

[100] - Müslim, 2598-ci hədis.

Hədisdən aydın olur ki, müsəlman həmişə müsəlmanlara xeyir-dua etməli, onları söyməkdən tənə və lənət etməkdən uzaq olmalıdır.

Abdullah ibn Ömərdən (radiyallahu anhumə) rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Möminə lənətcil olmaq yaraşmaz".***[101]

Abdullah ibn Məsuddan *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Mömin tənə edən, lənət oxuyan, kobud və əxlaqsız olmaz".***[102]

Həmçinin, Abdullah ibn Amrdan *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Müsəlman o kəsdir ki, müsəlmanlar onun dilindən və əlindən salamat qalar."***[103]

Əgər müsəlman müsəlmanlara dua etməzsə, xeyir verməzsə, onların ehtiyacını ödəməyə çalışmazsa, heç olmasa şər və əziyyət verməkdən uzaq olmalıdır.

Əbu Musa əl-Əşaridən *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Hər bir müsəlmana sədəqə vermək vacibdir. Dedilər: - Ey Allahın Peyğəmbəri, əgər tapmazsa? Dedi: - Əli ilə çalışsın, özünə mənfəət qazansın və sonra sədəqə versin. Dedilər: - Əgər bacarmazsa? Dedi: - Çətinlikdə olana kömək etsin. Dedilər: - Əgər bacarmazsa? Dedi: - Yaxşı işləri əmr etsin. Dedilər: - Əgər bacarmazsa? Dedi: - Şər verməkdən çəkinsin. Çünki bu onun üçün sədəqədir."*** [104]

Onu da bilmək lazımdır ki, müsəlmanlara tən və lənət etməyin şərinin dərəcələri vardır. Bu dərəcələrin ən şərlisi və qorxulusu

---

[101] - Tirmizi, 2019- cu hədis.

[102] - Tirmizi, 1977-ci hədis, Albani səhihləşdirmişdir, "əs-Sahihə", 320-ci hədis.

[103] - Buxari, 10-cu hədis; Müslim, 41-ci hədis.

[104] - Buxari, 1445-ci hədis; Müslim, 1008-ci hədis.

müsəlmanların ən xeyirlilərini - səhabələri və onlara həqiqi tabe olan elm və iman əhlini tən və lənət etməkdir. Şübhə yoxdur ki, bu çirkin işlərə yalnız qəlbləri xəstə olan və yolunu azmış bidət əhlində rast gəlmək olar. Halbuki, Allah-təala "Qurani-Kərim" də səhabələri bir neçə yerdə tərifləmiş, onların həqiqi iman sahibi, əməli-saleh olduqlarını təsdiqləmiş, Cənnət əhli olduqlarını bəyan etmiş və hətta, onlara tabe olmağı əmr etmişdir.

Allah-təala buyurur:

﴿وَالسَّابِقُونَ الأَوَّلُونَ مِنَ الْمُهَاجِرِينَ وَالأَنصَارِ وَالَّذِينَ اتَّبَعُوهُم بِإِحْسَانٍ رَّضِيَ اللّهُ عَنْهُمْ وَرَضُواْ عَنْهُ وَأَعَدَّ لَهُمْ جَنَّاتٍ تَجْرِي تَحْتَهَا الأَنْهَارُ خَالِدِينَ فِيهَا أَبَدًا ذَلِكَ الْفَوْزُ الْعَظِيمُ﴾

**"(İslamı) ilk əvvəl qəbul edib (bu işdə başqalarından) irəli düşən mühacirlərə və ənsara, Həmçinin, yaxşı işlər görməkdə onların ardınca gedən kimsələrə gəldikdə, Allah onlardan, onlar da Allahdan razıdırlar. (Allah) onlar üçün əbədi qalacaqları, (ağacları) altından çaylar axan cənnətlər hazırlamışdır. Bu, böyük qurtuluşdur (uğurdur)!"**[105]

Həmçinin, buyurmuşdur:

﴿وَمَا لَكُمْ أَلَّا تُنفِقُوا فِي سَبِيلِ اللَّهِ وَلِلَّهِ مِيرَاثُ السَّمَاوَاتِ وَالْأَرْضِ لَا يَسْتَوِي مِنكُم مَّنْ أَنفَقَ مِن قَبْلِ الْفَتْحِ وَقَاتَلَ أُوْلَئِكَ أَعْظَمُ دَرَجَةً مِّنَ الَّذِينَ أَنفَقُوا مِن بَعْدُ وَقَاتَلُوا وَكُلًّا وَعَدَ اللَّهُ الْحُسْنَى وَاللَّهُ بِمَا تَعْمَلُونَ خَبِيرٌ﴾

**"(Ey insanlar!) Sizə nə olub ki, (mal-dövlətinizi) Allah yolunda xərcləmirsiniz? Halbuki, göylərin və yerin mirası (bütün sərvəti, eləcə də, siz öləndən sonra qoyub gedəcəyiniz malın hamısı), ancaq Allahındır. Sizlərdən (mal-dövlətini) fəthdən (Məkkənin fəthindən) əvvəl (Allah yolunda) sərf edənlər və (müşriklərə qarşı) vuruşanlar (başqaları ilə) eyni**

---

105 - 9)- "ət- Tövbə" - 100.

**deyillər. Onlar (mallarını Allah yolunda) fəthdən sonra sərf edib döyüşənlərdən dərəcə etibarilə daha üstündürlər. Bununla belə, Allah onların hamısına (həm birincilərə, həm də ikincilərə) ən gözəl mükafat (Cənnət) vəd buyurmuşdur. Allah sizin nə etdiklərinizdən xəbərdardır!"** [106]

Həmçinin, buyurmuşdur:

﴿مُّحَمَّدٌ رَّسُولُ اللَّهِ وَالَّذِينَ مَعَهُ أَشِدَّاء عَلَى الْكُفَّارِ رُحَمَاء بَيْنَهُمْ تَرَاهُمْ رُكَّعًا سُجَّدًا يَبْتَغُونَ فَضْلًا مِّنَ اللَّهِ وَرِضْوَانًا سِيمَاهُمْ فِي وُجُوهِهِم مِّنْ أَثَرِ السُّجُودِ ذَلِكَ مَثَلُهُمْ فِي التَّوْرَاةِ وَمَثَلُهُمْ فِي الْإِنجِيلِ كَزَرْعٍ أَخْرَجَ شَطْأَهُ فَآزَرَهُ فَاسْتَغْلَظَ فَاسْتَوَى عَلَى سُوقِهِ يُعْجِبُ الزُّرَّاعَ لِيَغِيظَ بِهِمُ الْكُفَّارَ وَعَدَ اللَّهُ الَّذِينَ آمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ مِنْهُم مَّغْفِرَةً وَأَجْرًا عَظِيمًا﴾

**"Muhəmməd Allahın Peyğəmbəridir. Onunla birlikdə olanlar [möminlər] kafirlərə qarşı sərt, bir-birinə [öz aralarında] isə mərhəmətlidirlər. Sən onları [namaz vaxtı] rüku edən, səcdəyə qapanan, Allahdan riza və lütf diləyən görərsən. Onların əlaməti [axirətdə] üzlərində olan səcdə izidir [nurudur]. Bu onların "Tövrat"dakı vəsfidir. "İncil" də isə onlar elə bir əkinə bənzədilirlər ki, o artıq cücərtisini üzə çıxarmış, onu bəsləyib cana-qüvvətə gətirmiş, o da [o cücərti də] möhkəmlənib gövdəsi üstünə qalxaraq əkinçiləri heyran qoymuşdur. [Allahın bu təşbihi] kafirləri qəzəbləndirmək üçündür. Onlardan iman gətirib yaxşı əməllər edənlərə Allah məğfirət [günahlardan bağışlanma] və böyük mükafat [Cənnət] vəd buyurmuşdur!"** [107]

Başqa bir ayədə buyurmuşdur:

---

[106] -57)- "əl-Hədid" - 10.

[107] - 48) - "əl- Fəth" - 29

﴿لِلْفُقَرَاءِ الْمُهَاجِرِينَ الَّذِينَ أُخْرِجُوا مِن دِيَارِهِمْ وَأَمْوَالِهِمْ يَبْتَغُونَ فَضْلًا مِّنَ اللَّهِ وَرِضْوَانًا وَيَنصُرُونَ اللَّهَ وَرَسُولَهُ أُولَئِكَ هُمُ الصَّادِقُونَ﴾ ﴿وَالَّذِينَ تَبَوَّؤُوا الدَّارَ وَالْإِيمَانَ مِن قَبْلِهِمْ يُحِبُّونَ مَنْ هَاجَرَ إِلَيْهِمْ وَلَا يَجِدُونَ فِي صُدُورِهِمْ حَاجَةً مِّمَّا أُوتُوا وَيُؤْثِرُونَ عَلَى أَنفُسِهِمْ وَلَوْ كَانَ بِهِمْ خَصَاصَةٌ وَمَن يُوقَ شُحَّ نَفْسِهِ فَأُولَئِكَ هُمُ الْمُفْلِحُونَ﴾

**"(Bu qənimət) yurdlarından qovulub çıxardılmış, Allahdan mərhəmət və riza diləyən, Allaha və Onun Peyğəmbərinə kömək edən yoxsul mühacirlərə məxsusdur. Onlar (imanlarında, sözlərində və işlərində) doğru olan kimsələrdir!**

**Onlardan (mühacirlərdən) əvvəl (Mədinədə) yurd salmış və (Peyğəmbərə** ***(sallallahu aleyhi va əlihi va səlləm)*** **qəlbən) iman gətirmiş kimsələr (ənsar) öz yanlarına (şəhərlərinə) mühacirət edənləri sevər, onlara verilən qənimətə görə ürəklərində həsəd (qəzəb) duymaz, özləri ehtiyac içində olsalar belə, onları özlərindən üstün tutarlar. (Allah tərəfindən) nəfsinin xəsisliyindən (tamahından) qorunub saxlanılan kimsələr – məhz onlar nicat tapıb səadətə (Cənnətə) qovuşanlardır!"** [108]

Həmçinin, buyurmuşdur:

﴿لَقَدْ رَضِيَ اللَّهُ عَنِ الْمُؤْمِنِينَ إِذْ يُبَايِعُونَكَ تَحْتَ الشَّجَرَةِ فَعَلِمَ مَا فِي قُلُوبِهِمْ فَأَنزَلَ السَّكِينَةَ عَلَيْهِمْ وَأَثَابَهُمْ فَتْحًا قَرِيبًا﴾

**"(Ya Peyğəmbər!) And olsun ki, (Hüdeybiyyədə) ağac altında sənə beyət etdikləri zaman Allah möminlərdən razı oldu. (Allah) onların ürəklərində olanı (sənə sadiq qalacaqlarını, əhdə vəfa edəcəklərini) bildi, onlara (öz dərgahından) arxayınlıq (rahatlıq,**

---

[108] - 59) "əl- Həşr" - 8-9

**səbr, səbat, mənəvi qüvvə) göndərdi və onları yaxın gələcəkdə qazanılacaq bir qələbə (Xeybərin fəthi) ilə mükafatlandırdı.”** [109]

Əbu Səid əl-Xudridən *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* səhabələri söyməkdən onları tən və lənət etməkdən çəkindirərək buyurmuşdur:

***“Mənim əshabələrimdən heç bir kəsi söyməyin! Əgər sizin biriniz Uhud dağı qədər qızıl sədəqə verərsə, onların verdiyi bir ovuc sədəqəyə hətta, yarısına belə çatmaz.”*** [110]

Həmçinin, müsəlmanların ölülərini də söymək və lənət etmək olmaz.

Şeyxu-l-İslam ibn Teymiyyə *(rahiməhullah)* demişdir: “Ölülərə lənət etmək dirilərə lənət etməkdən pisdir. Çünki Peyğəmbərdən *(sallallahu aleyhi va əlihi va səlləm)* rəvayət olunur ki:

***“Ölüləri söyməyin! Artıq onlar etdikləri əməllərinə qovuşmuşlar.”*** [111]

Həmçinin, digər bir hədisdə demişdir:

***“Ölülərimizi söyərək, dirilərimizə əziyyət verməyin.”*** [112]

Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* bu hədisi bəzilərinin kafirlərdən olan Əbu Cəhli və qeyrilərini söyərək onların İslamı qəbul etmiş qohumlarına əziyyət verdiklərini görərək söyləmişdir. [113]

## Müsəlmanlardan olan fasiqləri lənət etməyin hökmü

İslam dini bizə müəyyən bir müsəlman olan fasiqi lənət etməyi əmr etməmişdir. Lakin Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* ümumi olaraq fasiq müsəlmanı təyin etmədən lənət etmişdir.

Əbu Hureyrədən rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

---

109 - 48) “əl-Fəth” - 18

110 - Buxari, 3673-cü hədis; Müslim, 2540-cı hədis.

111 - Buxari, 1393-cü hədis.

112 - Tirmizi, 1982-ci hədis, Albani səhihləşdirmişdir, “Sahih-l-cəmi”, 7312-ci hədis.

113 - “Minhəcu-s-sunnə”, 4/572-573.

***"Allah oğruya lənət etsin...!"***[114]

Həmçinin, Əli ibn Əbu Talibdən *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Allahdan qeyrisinə qurban kəsənə Allah lənət etsin! Cinayətkara sığınacaq verənə Allah lənət etsin! Valideyninə lənət edənə Allah lənət etsin! (Yerin) nişanələrini dəyişənə***[115] ***Allah lənət etsin!"***[116]

Həmçinin, digər bir hədisdə isə belə buyurmuşdur:

***"Allah şəraba, onu çəkənə, çəkdirənə, daşıyana, daşıtdırana, süzənə, içənə və qiymətini yeyənə lənət etsin."***[117]

Alimlər müəyyən bir fasiq müsəlmana lənət etməyin (yəni Allah filankəsə şərab içdiyinə görə, lənət etsin və s.) hökmündə ixtilaf etmişlər. Bəziləri icazəli olduğunu, bəziləri isə icazəli olmadığını söyləmişlər. İmam Əhməd onun məkruh olduğunu söyləmişdir. Lakin ümumi olaraq Allah-təala "Qurani-Kərim"də buyurduğu kimi:

﴿...أَلَا لَعْنَةُ اللَّهِ عَلَى الظَّالِمِينَ﴾

**"... Zalimlərə Allahın lənəti olsun!"** [118] demək olar

Ömər ibn əl-Xəttabdan *(radiyallahu anhu)* rəvayət olunur ki:

***"Peyğəmbərin (sallallahu aleyhi va əlihi va səlləm) dövründə Abdullah adlı bir kişi var idi. Ləqəbi Himar idi. Artıq Peyğəmbər (sallallahu aleyhi va əlihi va səlləm) onu şərab içdiyinə görə şallaqlamışdı. Bir gün (yenə də şərab içdiyinə görə) gətirildi və Peyğəmbər (sallallahu aleyhi va əlihi va səlləm) onun şallaqlanmasını əmr etdi və əmr yerinə yetirildi. Orada olan bir kişi dedi: - Allah***

---

114 - Buxari, 6783-cü hədis; Müslim, 1687-ci hədis.

115- Qonşunun və ya qonşu ölkənin torpağını mənimsəyən.

116 - Müslim, 5097-ci hədis.

117 - əbu Davud, 3673-cü hədis, Albani səhihləşdirmişdir. "əl-İrvau-l-ğalil", 2385-ci hədis.

118 - 11) "Hud" - 18

***ona lənət etsin! Bu nə çox [şərab içdiyinə görə Peyğəmbərin (sallallahu aleyhi va əlihi va səlləm) yanına] gətirilir?! Peyğəmbər (sallallahu aleyhi va əlihi va səlləm) dedi: - Ona lənət etməyin! Allaha and olsun ki, həqiqətən o, Allahı və Rəsulunu sevir."*** [119]

İbn Teymiyyə *(rahiməhullah)* demişdir: "Artıq Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* çoxlu şərab içən bu kişinin, Allahı və Rəsulunu sevdiyini bəyan edərək, onu lənət etməkdən çəkindirdi. Halbuki, keçən hədislərdən aydın oldu ki, Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* şərab içəni lənətləmişdir. Bu ona dəlildir ki, ümumi olaraq (fasiq müsəlmana) lənət etmək olar. Lakin müəyyən edərək Allahı və Rəsulunu sevən (fasiq müsəlmana) lənət etmək olmaz." [120]

**19. Ata - ana və qohum əqrəba üçün dua etmək**

Artıq bizə müsəlmanlar üçün dua etməyin, xeyir, rəhmət və məğfirət diləməyin nə qədər böyük bir əcri olduğu məlum oldu. Əgər ümumi olaraq müsəlmanlar üçün dua etmək tələb olunan üstün bir işdirsə, qohum-əqrəba üçün, xüsusi ilə də ata-ana üçün dua etmək daha da üstün və qat-qat gözəldir. Çünki qohumlar, xüsusi ilə də ata-ana yaxşılıq edilməkdə qeyrilərinə nisbətən daha da üstün və layiqdirlər.

Necə ki, Allah-təala buyurmuşdur:

﴿وَالَّذِينَ آمَنُواْ مِن بَعْدُ وَهَاجَرُواْ وَجَاهَدُواْ مَعَكُمْ فَأُوْلَـئِكَ مِنكُمْ وَأُوْلُواْ الأَرْحَامِ بَعْضُهُمْ أَوْلَى بِبَعْضٍ فِي كِتَابِ اللّهِ إِنَّ اللّهَ بِكُلِّ شَيْءٍ عَلِيمٌ﴾

**"Sonradan (Hüdeybiyyə sazişindən sonra, Məkkənin fəthindən əvvəl) iman gətirib hicrət edənlər və sizinlə bərabər döyüşənlər (cihad edənlər) də sizdəndirlər. Qohumlar Allahın**

---

119 - Buxari, 6780.

120 - "Minhəcu-s-sunnə", 4/567-574

**Kitabında bir-birinə daha yaxındırlar. Həqiqətən, Allah hər şeyi biləndir!"** [121]

Bəhz ibn Həkim atasından, o da babasından rəvayət edir:

*"Dedim: - Ey Allahın Rəsulu, kimə yaxşılıq edim? Dedi: - Anana. Dedim: - [Sonra] Kimə yaxşılıq edim? Dedi: - Anana. Dedim: - [Bəs sonra] Kimə yaxşılıq edim? Dedi: - Atana sonra da yaxınlarına. (Yaxın qohumlarına)."*[122]

Ən üstün yaxşılıqlardan biri də duadır.

Allah - təala buyurmuşdur:

﴿وَقَضَى رَبُّكَ أَلَّا تَعْبُدُوا إِلَّا إِيَّاهُ وَبِالْوَالِدَيْنِ إِحْسَانًا إِمَّا يَبْلُغَنَّ عِنْدَكَ الْكِبَرَ أَحَدُهُمَا أَوْ كِلَاهُمَا
فَلَا تَقُلْ لَهُمَا أُفٍّ وَلَا تَنْهَرْهُمَا وَقُلْ لَهُمَا قَوْلًا كَرِيمًا . وَاخْفِضْ لَهُمَا جَنَاحَ الذُّلِّ مِنَ الرَّحْمَةِ وَقُلْ
رَبِّ ارْحَمْهُمَا كَمَا رَبَّيَانِي صَغِيرًا﴾

**"Rəbbin yalnız Ona ibadət etməyi və valideynlərə yaxşılıq etməyi [onlara yaxşı baxıb gözəl davranmağı] buyurmuşdur. Əgər, onların biri və ya hər ikisi, sənin yanında [yaşayıb] qocalığın ən düşkün çağına yetərsə, onlara "Uf!" – belə demə, üstlərinə qışqırıb acı söz söyləmə. Onlarla xoş danış!**

**Onların hər ikisinə acıyaraq, mərhəmət qanadının altına alıb "Ey Rəbbim! Onlar məni körpəliyimdən [nəvazişlə] tərbiyə edib bəslədikləri kimi, Sən də onlara rəhm et! "- de."** [123]

Ayədən məlum olur ki, Allah-təala valideynlərə yaxşılığın bütün növləri ilə - sözlə və fellə - yaxşılıq etməyi, xüsusi ilə də onlar üçün rəhmət oxumağı və dua etməyi əmr etmişdir. Çünki onlar insanın var olmasına səbəbdirlər.

---

[121] - 8) "əl-Ənfəl" - 75.

[122] - Tirmizi, 1897-ci hədis, Albani həsənləşdirmişdir. "Sahihu-l-ədəbi-l-Mufrad" 3-cü hədis.

[123] - 17) "əl- İsra" - 23-24.

Əgər valideynlər müsəlmandırlarsa onlara rəhmət və məğfirət diləmək olar. Lakin kafir və ya müşrikdirlərsə, onlar üçün rəhmət və məğfirət diləmək olmaz.

Allah-təala buyurmuşdur:

﴿مَا كَانَ لِلنَّبِيِّ وَالَّذِينَ آمَنُواْ أَن يَسْتَغْفِرُواْ لِلْمُشْرِكِينَ وَلَوْ كَانُواْ أُوْلِي قُرْبَى مِن بَعْدِ مَا تَبَيَّنَ لَهُمْ أَنَّهُمْ أَصْحَابُ الْجَحِيمِ﴾

**"Müşriklərin cəhənnəmlik olduqları (müsəlmanlara) bəlli olduqdan sonra onlarla qohum olsalar belə, Peyğəmbərə və iman gətirənlərə onlar üçün bağışlanma diləmək yaraşmaz!"** [124]

Lakin onlara hidayət və haqqı qəbul etmələri üçün dua etmək bəyənilir.

Əbu Hureyrənin belə dediyi rəvayət olunur:

***"Anam müşrik idi və mən onu İslama dəvət edirdim. Bir gün onu (İslama) dəvət etdiyim zaman mənə Rəsulullah barədə sevmədiyim bir şey eşitdirdi. Mən ağlayaraq Peyğəmbərin (sallallahu aleyhi va əlihi va səlləm) yanına getdim və dedim: - Ya Rəsulullah, mən anamı İslama dəvət edirdim, lakin o məndən üz çevirirdi. Bu gün [yenə] dəvət etdim. Mənə Sənin barəndə sevmədiyim bir şey eşitdirdi. Allaha dua et, Əbu Hureyrənin anasına hidayət versin. Peyğəmbər (sallallahu aleyhi va əlihi va səlləm) dedi: - Allahım, Əbu Hureyrənin anasına hidayət ver. Mən Peyğəmbərin (sallallahu aleyhi va əlihi va səlləm) duasına sevinərək çıxdım. O vaxt ki, gəlib qapıya çatdım, qapının bağlı olduğunu gördüm. Anam ayaqlarımın səsini eşidərək dedi: - Yerində dur, ey Əbu Hureyrə! Və mən suyun səsini eşitdim. [Anam] qusul edərək paltarını geyinib şalını örtmədən qapını açdı. Sonra dedi: - Ey Əbu Hureyrə, şəhadət verirəm ki, Allahdan başqa [ibadət olunmağa haqqı olan məbud] ilah yoxdur və şəhadət verirəm ki, Məhəmməd onun qulu və elçisidir. Mən sevincimdən ağlaya-***

---

[124] - 9) "ət-Tövbə" - 113.

***ağlaya Peyğəmbərin** (sallallahu aleyhi va əlihi va səlləm) **yanına gəldim və dedim: - Ey Allahın elçisi, gözün aydın! Artıq Allah-təala Sənin duanı qəbul edərək Əbu Hureyrənin anasına hidayət verdi..."***[125]

Əgər valideynlər müşrikdirlərsə, onlar üçün Allah-təaladan hidayət istəyərək dua etmənin icazəli, hətta, müstəhəb olduğu hədisdən aydındır. Lakin lazımdır ki, dua ilə yanaşı dəvət də yaddan çıxarılmasın. Necə ki, Əbu Hureyrə *(radiyallahu anhu)* həm anasını İslama dəvət edərdi, həm də Allahdan onun üçün hidayət diləyərdi.

Saleh övladın müsəlman valideynləri üçün etdiyi duasının onlar həyatda ikən faydası olduğu kimi eləcə də vəfat etdikdən sonra da faydası vardır.

Əbu Hureyrədən *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"İnsan öldükdən sonra [savab qazanmaq üçün etdiyi] əməli kəsilər. Yalnız üç şeydən – qoyub getdiyi daimi sədəqədən (tikdiyi məscid, məktəb, bulaq, əkdiyi ağac və s.) yaxud mənfəət qazanılan elmindən, yaxud saleh övladının (onun üçün) etdiyi duasından başqa."***[126]

Həmçinin, Əbu Hureyrənin *(radiyallahu anhu)* belə dediyi rəvayət olunur:

***"İnsan öldükdən sonra dərəcəsi qaldırılar və (təəcüblənərək) deyər: - Ya Rəbb, bu nədir? Ona deyilər: - Övladın sənin üçün bağışlanma diləmişdir."***[127]

Valideynlər üçün dua edərək rəhmət oxumaq, onlar üçün bağışlanma diləmək onlara olan ən böyük yaxşılıqlardan biridirsə, Həmçinin, bilmək lazımdır ki, onları söymək və lənət etmək ən böyük günahlardan sayılır. Fərqi yoxdur ki, insan valideynlərini

---

[125] - Müslim, 2491-ci hədis.

[126] - Müslim 1631; əbu Davud 2880; Nəsai 6/151

[127] - Albani həsənləşdirmişdir. "Sahihu-l-ədəbi-l-mufrad", 27,

özü söyə (bu daha da şiddətlidir), yaxud da onların söyülməsinə səbəb ola.

Abdullah ibn Amrdan *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Həqiqətən, böyük günahların ən böyüyü kişinin valideynlərini lənət etməsidir. Deyildi: - Ey Allahın Rəsulu, kişi valideynini necə lənət edə bilər? Dedi: - Bir kişi başqa bir kişini söyər, [oda qayıdıb] onun atasını və anasını söyər."***[128]

Abdullah ibn Amr əl-Asın *(radiyallahu anhu)* belə dediyi rəvayət olunur:

***"Allah dərgahında olan böyük günahlardan biri də kişinin valideyninin söyülməsinə səbəb olmasıdır."***[129]

Həmçinin, Əli ibn Əbi Talib *(radiyallahu anhu)* Peyğəmbərin *(sallallahu aleyhi va əlihi va səlləm)* belə dediyini rəvayət etmişdir:

***"Allah valideynlərinə lənət edənə lənət etsin."*** [130]

Allahdan bizim, valideynlərimizin və bütün müsəlmanların günahlarının bağışlanmasını istəyirəm. Həqiqətən də, O, bağışlayan və rəhimlidir.

## 20. Allahdan saleh həyat yoldaşı və saleh övladlar istəmək

Hər bir kəsə kişinin istər dünya işlərində istərsə də axirət işlərində ən gözəl yardımçısı onun saleh həyat yoldaşının olduğu bəllidir. Necə ki, Peyğəmbərimiz *(sallallahu aleyhi va əlihi va səlləm)* bizə ən qiymətli şeyləri nəsihət edərək buyurmuşdur:

***"Hər biriniz şükr edən qəlb, zikr edən dil və axirət işlərinə kömək edən möminə zövcə seçin."***[131]

Ona görə də hər bir müsəlman evlənməyə qədəm qoymamışdan öncə saleh, əxlaqlı, itaətkar və s. zövcə və ovladlara nail olması üçün onun ən ilk atacağı addım Allaha əl açaraq uzun- uzadı dua etməsi olmalıdır. Belə etmək gələcək ömür-gün yoldaşını və övladları tərbiyə etməyin ən ilk

---

128 - Buxari, 5937; Müslim, 90.

129 - "Sahihu-l-ədəbi-l-mufrad", 22. Albani həsənləşdirmişdir.

130 - Müslim, 1978.

131- ibn Macə, 1856.

metodudur. Allah təala Öz sevimli qullarından bəhs edərək buyurmuşdur:

﴿ وَالَّذِينَ يَقُولُونَ رَبَّنَا هَبْ لَنَا مِنْ أَزْوَاجِنَا وَذُرِّيَّاتِنَا قُرَّةَ أَعْيُنٍ وَاجْعَلْنَا لِلْمُتَّقِينَ إِمَامًا ﴾

**“Və o kəslər ki: “Ey Rəbbimiz, bizə zövcələrimizdən və uşaqlarımızdan (sənə itaət etməkdə bizi sevindirib) gözümüzün işığı (bəbəyi) olanlar ehsan buyur və bizi müttəqilərə imam (rəhbər) et!” – deyərlər”.**[132]

Həmçinin İbrahim peyğəmbərin *(aleyhissələm)* belə dediyini buyurmuşdur:

﴿ رَبِّ اجْعَلْنِي مُقِيمَ الصَّلاَةِ وَمِن ذُرِّيَّتِي رَبَّنَا وَتَقَبَّلْ دُعَاء ﴾

**“Ey Rəbbim! Məni də, nəslimdən olanları da (vaxtlı-vaxtında, lazımınca) namaz qılan et. Ey Rəbbimiz! Duamı qəbul buyur!”**[133]

Həmçinin Zəkəriyyə peyğəmbərin belə dediyini buyurmuşdur:

﴿ هُنَالِكَ دَعَا زَكَرِيَّا رَبَّهُ قَالَ رَبِّ هَبْ لِي مِن لَّدُنْكَ ذُرِّيَّةً طَيِّبَةً إِنَّكَ سَمِيعُ الدُّعَاء ﴾

**(O zaman) Zəkəriyyə Rəbbinə dua edərək dedi: “Ey Rəbbim! Mənə də Öz tərəfindən yaxşı övlad bəxş et! Sən, həqiqətən, duaları eşidənsən!”.**[134]

Allah – təaladan hər birimizə saleh həyat yoldaşı və saleh övladlar nəsib etməsini diləyirəm.

## 21. Müsəlman rəhbərlər üçün dua etmək

Mövzunun adından məlum olduğu kimi duanın ədəblərindən biri də müsəlmanların rəhbərləri üçün dua etməkdir. Hansı ki, onların əli ilə (Allahın istəyindən sonra) ölkədə əmin-amanlıq və sakitlik olur, işlər nizama salınır, düşmənlə döyüş edilir. Əgər onlar olmazsa ölkədə əmin-amanlıq və sakitlik yox olar, qarışıqlıq baş alıb gedər, oğruluq, ölüm-itim və s. çoxalar.

---

132 -25) “əl- Furqan”- 74.

133- 14) “İbrahim” -40.

134 - 3) “Əli İmran”- 38

İbn Teymiyyə *(rahiməhullah)* demişdir: "Bilmək lazımdır ki, insanların rəhbərinin olması dinin ən böyük vacibatlarından biridir... Çünki Allah-təala yaxşı işləri əmr etməyi və pis işlərdən çəkindirməyi vacib buyurmuşdur. Bunlar yalnız qüvvət və rəhbərliyin əli ilə olunur... Ona görə də rəhbərə itaət etməklə Allaha yaxınlaşmaq lazımdır. Çünki onlara Allahın və Rəsulunun əmrindən çıxmamaq şərti ilə itaət etmək, Allaha yaxınlaşmağın ən üstün yollarından biridir." [135]

Hər bir müsəlman öz rəhbərinə yaxşı işlərdə itaət etməli, onlara hiylə etməyib şər işlərdən çəkinməli və aldatmamalıdır. Çünki belə etmək İslama, Allaha və Onun Rəsulunun qoyduğu yola ziddir.

Allah-təala buyurmuşdur:

﴿يَا أَيُّهَا الَّذِينَ آمَنُواْ أَطِيعُواْ اللّهَ وَأَطِيعُواْ الرَّسُولَ وَأُوْلِي الأَمْرِ مِنكُمْ فَإِن تَنَازَعْتُمْ فِي شَيْءٍ فَرُدُّوهُ إِلَى اللّهِ وَالرَّسُولِ إِن كُنتُمْ تُؤْمِنُونَ بِاللّهِ وَالْيَوْمِ الآخِرِ ذَلِكَ خَيْرٌ وَأَحْسَنُ تَأْوِيلاً﴾

**"Ey iman gətirənlər! Allaha, Peyğəmbərə və özünüzdən olan ixtiyar (əmr) sahiblərinə (rəhbərlərinizə) itaət edin! Əgər bir iş barəsində mübahisə etsəniz, Allaha və Qiyamət gününə inanırsınızsa, onu Allaha və Peyğəmbərə həvalə edin! Bu daha xeyirli və nəticə etibarilə daha yaxşıdır."** [136]

Təmim ibn Ovs əd-Dəridən *(radiyallahu anhu)* Peyğəmbərin *(sallallahu aleyhi va əlihi va səlləm)* belə dediyi rəvayət edilmişdir:

***"Din nəsihətdir. Dedik: - Kimin üçün? Dedi: - Allah üçün, kitabı (Quran) üçün, Rəsulu üçün, müsəlmanların başçıları və onların rəiyyəti üçün. "***[137]

Nəvəvi *(rahiməhullah)* bu hədisin şərhində demişdir: "Müsəlmanların başçıları üçün nəsihət, onlarla haqq üzərində

---

[135] - "əs-Siyasətu-ş-şəriyyə", səh. 161-162.

[136] -4) "ən-Nisə" - 59.

[137] - Müslim, 55.

köməkləşmək və haqq olan şeylərdə itaət etmək, onlara qarşı çıxmamaq və insanları onlara itaət etməyə çağırmaqdır."

Xəttabi *(rahiməhullah)* demişdir: "Həmçinin, müsəlmanların başçılarına nəsihət, onların arxasında namaz qılmaq, onlarla birlikdə döyüş etmək, sədəqə mallarını onlara vermək, əgər onlardan zülm və xoşa gəlməyən davranış zahir olarsa, qılınc çəkərək onlara qarşı çıxmamaq... onlara islah və doğru yolda olmaları üçün dua etməkdir."[138]

Şübhə yoxdur ki, müsəlmanların başçılarına olan nəsihətlərdən biri də onlar üçün dua edərək Allahdan islah, düzgün, sağlam və qüvvətli olmalarını istəməkdir. Çünki onların islah olmaları ümmətin islah olmasıdır. Ona görə də imam Fudeyl ibn İyad *(rahiməhullah)* demişdir: "Əgər mənim qəbul olunası bir duam olsaydı o duanı başçı üçün edərdim. Çünki başçı islah və saleh olarsa ölkə və camaat əmin-amanlıqda olar. "[139]

Həmçinin, imam Əhməd *(rahiməhullah)* də Fudeyl ibn İyadın *(rahiməhullah)* sözünə oxşar söz söyləmişdir.

Əbu Bəkr əl-Mərvazi *(rahiməhullah)* demişdir: "Əbu Abdullahın - yəni Əhməd ibn Hənbəlin – (Xəlifə) Mütəvəkkili *(rahiməhullah)* xatırlayaraq belə dediyini eşitdim: Həqiqətən də mən ona saleh və sağlam olması üçün dua edirəm."[140]

Ölkə hakimləri ilə necə rəftar etmək barədə əhli sünnə alimləri dərindən maraqlanmış və bunu İslam dininin ən mühüm məsələlərindən biri hesab etmişlər.

Əbu Cəfər ət-Tahavi *(rahiməhullah)* demişdir: "Ölkə başçılarımıza və hakimlərimizə, hətta, zülm etsələr belə, qarşı çıxmağı doğru görmür, onlara qarğış etmir, onlara itaət etməkdən əl çəkmir, əgər günah etməyi əmr etməzlərsə, onlara olan itaəti Allaha olan itaət

---

138 - "Şərhu sahihi Müslim", 2/227.

139 - Əbu Nueym. "əl-Hilyə", 8/91, "Lə-ləkəi", "Şərhu usulu-l-etiqad", 1/197.

140 - Xalləl. "əs-Sunnə",16.

kimi fərz görür və onlara saleh və sağlam olmaları üçün dua edirik."[141]

Həmçinin, Əbu Bəkr əl-İsmaili demişdir: "Əhli sünnə hər bir müsəlman olan hakimin istər saleh olsun, istərsə də fasiq olsun arxasında fərz, cümə və qeyri namazları qılmağı doğru görür və onlara saleh və adil olmaları üçün dua edirlər."[142]

Hər bir müsəlmana vacibdir ki, hakimləri söyməkdən, onların qeybətini etməkdən, onlar üçün xeyir- dua edərək, qarğış etməkdən çəkinsin.

Ənəs ibn Malikin *(radiyallahu anhu)* belə dediyi rəvayət olunmuşdur:

***"Bizim böyüklərimiz olan Məhəmmədin (sallallahu aleyhi va əlihi va səlləm) bəzi səhabələri bizə qadağan edərək Peyğəmbərin (sallallahu aleyhi va əlihi va səlləm) belə dediyini nəql edərdilər: "Başçılarınızı söyməyin, onları aldadaraq nifrət etməyin. Allahdan qorxun və səbr edin...!"*** [143].

Həmçinin, ibn Abdilbarr *(rahiməhullah)* "Əgər sultana nəsihət, səbr və onun üçün dua etməyə imkan olmazsa, səhabələr rəhbərləri söyməyi qadağan edərdilər" - deyərək Ənəs ibn Malikin keçən hədisini zikr etmişdir." [144]

İmam Həsən ibn Əli əl-Barbəhəri *(rahiməhullah)* demişdir: "Əgər görsən ki, bir kişi sultana qarğış edir bil ki, o bidət əhlidir. Əgər eşitsən ki, bir kişi sultana saleh olması üçün dua edir, bil ki, o, inşəallah sunnə sahibidir." [145]

Şeyx Abdu-l-Aziz ibn Bəz *(rahiməhullah)* başçılara dua etməkdən imtina edən kəslər haqqında soruşularkən belə demişdir: "Bu onun cahilliyindən və bəsirət gözünün olmamasından irəli gəlir.

---

141 - "Şərhu-l-aqidətu-t-Tahəviyyə", səh. 428.

142 - "İitiqadu əhli-s-sunnə", səh. 55-56.

143 - İbn əbi Asim, "əs-Sunnə", səh. 488. Albani səhihləşdirmişdir.

144 - ət-Təmhid, 21/287.

145 - "Şərhu-s-sunnə", səh. 113.

Başçılara dua etmək Allaha yaxınlaşmağın ən üstün yollarından, ən gözəl itaətlərdən və Allaha və onun qullarına olan nəsihətdəndir... Əgər insanlara dua edilirsə, başçılar dua edilməyə daha layiqdirlər. Çünki onların islah olması ümmətin islah olmasıdır. Onlar üçün dua etmək ən mühüm dualardan və ən mühüm nəsihətlərdəndir..."[146]

Allah- təaladan rəhbərlərimizi, həmçinin digər müsəlman rəhbərləri dünya və axirətin səadəti olan İslam dini üzərində sabit etməsini, ölkəmizin firavanlığı və əmin- amanlığı uğrunda onlardan öz rəhmətini əsirgəməməsini diləyirəm.

**22. Duanı sakit və gizli etmək**

Allah-təala buyurmuşdur:

﴿ادْعُواْ رَبَّكُمْ تَضَرُّعًا وَخُفْيَةً إِنَّهُ لاَ يُحِبُّ الْمُعْتَدِينَ﴾

**"Rəbbinizə yalvara-yalvara, həm də gizlicə dua edin. Şübhəsiz ki, O (Allah) həddini aşanları (qışqıraraq dua edənləri) sevməz!"** [147]

Əbu Musa əl-Əşaridən *(radiyallahu anhu)* rəvayət olunan hədisdə demişdir:

***"Peyğəmbər (sallallahu aleyhi va əlihi va səlləm) ilə səfərdə idik. İnsanlar səslərini qaldıraraq təkbir gətirməyə başladılar. Peyğəmbər (sallallahu aleyhi va əlihi va səlləm) [onlara] dedi: - Ey insanlar, özünüzə yazığınız gəlsin. Siz eşitməyən və uzaq olana dua etmirsiniz. Siz eşidən və yaxın olana ... dua edirsiniz."*** [148]

Həsən əl-Basri *(rahiməhullah)* demişdir: "...Müsəlmanlar dua etməkdə çox çalışardılar. Lakin onların səsləri eşidilməzdi. Yalnız özləri və Rəbləri arasında bir pıçıltı olardı. Çünki Allah-təala buyurmuşdur:

---

146 - Abdu-r-Razzəq, "Fiqhu-l-əd iyə va-l-əzkər".

147 -7) "əl-Əraf" – 55.

148 - əl-Buxari, 2992-4205; Müslim, 2704.

**"Rəbbinizə yalvara-yalvara həm də gizlicə dua edin. "**

Həmçinin, Allah-təala saleh qulunun əməlindən razı qalaraq buyurmuşdur:

﴿ذِكْرُ رَحْمَةِ رَبِّكَ عَبْدَهُ زَكَرِيَّا . إِذْ نَادَى رَبَّهُ نِدَاءً خَفِيًّا . قَالَ رَبِّ إِنِّي وَهَنَ الْعَظْمُ مِنِّي وَاشْتَعَلَ الرَّأْسُ شَيْبًا وَلَمْ أَكُن بِدُعَائِكَ رَبِّ شَقِيًّا﴾

**"(Ya Rəsulum!) Bu sənin Rəbbinin öz qulu Zəkəriyyəyə olan mərhəmətinin xatırlanmasıdır!**

**(Zəkəriyyə) Rəbbinə gizlicə dua edib yalvardığı zaman belə demişdi: - Ey Rəbbim! Artıq sümüyüm sustalmış, başım ağappaq ağarmışdır. Ey Rəbbim! Sənə dua etməklə heç vaxt naümid olmamışam. (Nə dua etmişəmsə, qəbul olunmuşdur)[149]."** [150]

İbn Cureyc *(rahiməhullah)* demişdir: "Dua edərkən səsi yüksəldərək qışqırmaq və bağırmaq məkruhdur. Yalvararaq boyun əymək isə əmr olunmuşdur." [151]

Dua edərkən səsi yüksəltməyərək gizlicə etməyin duanın ədəblərindən olduğunu bildik.

Onu da bilmək lazımdır ki, belə etməyin nə qədər saysız-hesabsız faydası və fəziləti vardır.

İbn Teymiyyə *(rahiməhullah)* bu fəzilətlərdən bir neçəsini qeyd etmişdir:

**1). Dua edərkən səsi yüksəltməyərək gizlicə etmək imanın çoxluğundandır**

Çünki belə edən bilir ki, həqiqətən də Allah-təala gizli olan duanı eşidir.

**2). Allaha olan ədəb və təzimdir**

---

[149] -19) "Məryəm" - 2-3-4.

[150] - İbn Mubarak əz-Zuhd, səh. 45, "Təfsiru-t-Təbəri", 5/515.

[151] - "Təfsiru-t-Təbəri", 5/515.

Çünki başçılara xitab olunan zaman, yaxud bir şey istənilən zaman səsi yüksəldərək qışqırıb istənilmir, əksinə onların eşidəcəkləri qədər səs qaldırılır. Hətta, kim onların yanında səsini yüksəyə qaldırarsa, ona qəzəblənər və nifrət edərlər. Lakin Allah-təalanın misalı onların hamısından qat-qat üstündür.

Əgər Allah-təala gizli olan duanı eşidirsə, ədəbdəndir ki, onun qarşısında yalnız səsi gizlədərək, qışqırmadan dua edilsin.

**3).Duanı gizlicə etmək Allaha yalvarmağa və xuşunun artmasına daha yaxın olur**

Hansı ki, belə etmək duanın ruhu və əsasıdır. Çünki Allahdan qorxan, Ona boyun əyən və yalvaran kəs zəif və əli hər yerdən üzülmüşə bənzəyir ki, buna səsi qaldırmaq yox, əksinə alçaltmaq uyğun gəlir.

**4). İxlasın olmasına dələlət edir**

**5). Qəlbin dua edərkən Allaha tərəf yönəlməsinə səbəb olur:**

Lakin səsi yüksəltmək isə fikri dağıdaraq qəlbi yayındırır.

**6). Səsi yüksəltməyərək gizlicə etmək duanın davamlı olmasına səbəb olur;**

Çünki belə etməklə dil yorulmaz. Lakin bunun əksini edərsə, dili yorular və qüvvəti zəifləyər...[152]

## 23. İnsanın özünə, yaxud qeyrilərinə bəd dua (qarğış) etməməsi

Elə insanlar vardır ki, əsəbiləşdiyi zaman özünə, övladlarına, yaxud malına bəd dua edir. Halbuki, əgər etdiyi bəd dua baş verərsə, ona heç vaxt razı olmaz. İnsanın belə etməsi onun tələsgən olmasından və işinin aqibətini düşünməməsindən irəli gəlir.

Allah-təala buyurmuşdur:

﴿وَيَدْعُ الإِنسَانُ بِالشَّرِّ دُعَاءهُ بِالْخَيْرِ وَكَانَ الإِنسَانُ عَجُولاً﴾

---

152 - Əhməd ibn Teymiyyə, "Məcmu u-l-fətəva", 15/15-20; İbnu-l-Qayyim, "Bədəiu-l-Fəvaid", 3/6-10.

**“İnsan [özünə] xeyir-dua etdiyi kimi, bəd dua da edər. [Adamın hirsi tutduqda özünə, yaxud övladına bəd dua edər. Əgər Allah həmin şəxsin duasını qəbul etsə, dərhal onun özünü, yaxud övladını məhv etməlidir. Lakin Allah səbrlidir, bəndələrinə əzab verməkdə tələsməz]. İnsan [hər şeydə] tələsəndir [gördüyü işinin aqibətini düşünməyə hövsələsi çatmaz].”**[153]

İbn Kəsir *(rahiməhullah)* bu ayəni açıqlayaraq demişdir: “Allah-təala insanın tələsən olmasından bəzən özünə, övladına yaxud malına şər dua, yəni ölüm, həlak, lənət və buna bənzər dua etməsindən xəbər verir. Əgər rəbbi onun duasını qəbul edərsə, həlak olar.

Necə ki, Allah-təala buyurmuşdur:

﴿وَلَوْ يُعَجِّلُ اللَّهُ لِلنَّاسِ الشَّرَّ اسْتِعْجَالَهُم بِالْخَيْرِ لَقُضِيَ إِلَيْهِمْ أَجَلُهُمْ فَنَذَرُ الَّذِينَ لاَ يَرْجُونَ لِقَاءنَا فِي طُغْيَانِهِمْ يَعْمَهُونَ﴾

**“Əgər Allah insanlara, xeyri tezliklə istədikləri kimi, şəri də o tezliklə versəydi, şübhəsiz ki, əcəlləri çoxdan tamam olmuşdu. (Allah insanların yaxşı dualarını tez qəbul etdiyi kimi, qəzəbli halda etdikləri bəd duaları da dərhal qəbul buyursaydı, onlar çoxdan məhv olub gedərdilər. Allah bəndələrinə əzab verməkdə tələsməz, özlərini islah edib pis əməllərdən çəkinmək üçün möhlət verər). Bizimlə qarşılaşacaqlarına ümid etməyənləri öz azğınlıqları içərisində şaşqın bir vəziyyətdə qoyarıq!”**[154]

Mücahid *(rahiməhullah)* bu ayənin təfsirində demişdir: “Şər dua insanın tələsərək övladına yaxud həyat yoldaşına qarğış etməsidir. Halbuki, etdiyi bəd duanın həyata keçməsini istəməz.”[155]

Cabir ibn Abdullahın *(radiyallahu anhu)* belə dediyi rəvayət olunmuşdur:

---

153 - 17) “əl-İsra” - 11.

154 - 10) “Yunus” - 11; “Təfsiru-l-Qurani-l-Azım”, 5/45-46.

155 - İbn Cərir, “Cəmiu-l-Bəyan”, 9/47-48.

***"Peyğəmbərlə** (sallallahu aleyhi va əlihi va səlləm) **birlikdə Buvat dağı döyüşündə gedirdik. Peyğəmbər** (sallallahu aleyhi va əlihi va səlləm) **əl-Məcdi ibn Amr Cuhənini axtarırdı. Bir dəvəni bizdən olan beş, altı, yaxud yeddi kişi növbə ilə minirdi. Ənsardan olan bir kişinin dəvəni minmək növbəsi gəlib çatdı. O, dəvəni yerə yatıraraq üzərinə mindi və getməsi üçün başını buraxdı. Lakin dəvə yerindən tərpənmədi. (Bu zaman kişi dəvəyə) qışqıraraq "Allah sənə lənət etsin" - dedi. Peyğəmbər** (sallallahu aleyhi va əlihi va səlləm) **dedi: "Dəvəsinə lənət edən kimdir?" (Kişi): "Mənəm, ey Allahın Rəsulu". (Peyğəmbər** (sallallahu aleyhi va əlihi va səlləm) **dedi: "Düş onun üstündən! Bizimlə lənət olunmuş dəvə ilə gəlmə. Özünüzə, övladlarınıza, mallarınıza bəd dua etməyin. Allah-təalanın istənilən duaya cavab verdiyi elə bir saat vardır ki, o saata müvafiq olarsınız və (Allah-təala) sizin bəd duanızı qəbul edər. """***[156]

Hədisdən aydın olur ki, edilən bəd duanın qəbul olunmasına ehtimal vardır.

Həmçinin, Əbu Hureyrədən rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Üç qəbul olan dua vardır ki, onların qəbul olunmasına heç bir şəkk yoxdur: məzlumun duası, müsafirin duası və valideynin övladına etdiyi bəd dua."***[157]

Ona görə də müsəlman özünü övladları, mal-dövləti və.s üçün xeyir-bərəkət dualarına vərdiş etdirməli və qəzəbləndiyi zaman özünə, övladına, malına və s. bəd dua etməkdən çəkinməlidir. Çünki etdiyi bəd dua qəbul olar və sonra da onun qəbul olmasına peşman olar. Halbuki, o özü bu bəd duanı etmişdir.

---

156 - Müslim, 7437.

157 - əbu Davud, 1533, İbn Macə, 3862, Albani həsənləşdirmişdir. "əs-Sahihə", 596.

**24. Allahın geniş rəhmətini heç kəsdən əsirgəməmək**

İnsanın "Allahım, mənə ruzi ver, məndən qeyrilərinə ruzi vermə, Allahım, yalnız mənə rəhm et" və s. kimi deməsi bu qəbildəndir.

Əbu Hureyrədən *(radiyallahu anhu)* rəvayət olunan hədisdə demişdir:

***"Peyğəmbər (sallallahu aleyhi va əlihi va səlləm) namaza durdu və biz də durduq. Bir bədəvi namazın içində belə dedi: "Allahım, mənə və Məhəmmədə rəhm et, bizdən başqa heç bir kəsə rəhm etmə!" Peyğəmbər (sallallahu aleyhi va əlihi va səlləm) salam verib namazı bitirərək bədəviyə dedi: "Artıq geniş olanı - yəni Allahın rəhmətini - daraltdın."***[158]

İbn Həcər *(rahiməhullah)* bu hədisin şərhində demişdir: "İbn Battal dedi: "Bədəvi Allahın yaratdıqlarına rəhmət etməsinə (xəsislik) etdiyi üçün Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* ona etiraz etdi. Halbuki, Allah-təala onun əksini edəni səna edərək demişdir:

﴿وَالَّذِينَ جَاؤُوا مِن بَعْدِهِمْ يَقُولُونَ رَبَّنَا اغْفِرْ لَنَا وَلِإِخْوَانِنَا الَّذِينَ سَبَقُونَا بِالْإِيمَانِ وَلَا تَجْعَلْ فِي قُلُوبِنَا غِلًّا لِّلَّذِينَ آمَنُوا رَبَّنَا إِنَّكَ رَؤُوفٌ رَّحِيمٌ﴾

**"Onlardan (mühacirlərdən və ənsarlardan) sonra gələnlər belə deyirlər: - Ey Rəbbimiz! Bizi və bizdən əvvəlki iman gətirmiş (din) qardaşlarımızı bağışla. Bizim qəlblərimizdə iman gətirənlərə qarşı kinə (həsədə) yer vermə. Ey Rəbbimiz! Sən, həqiqətən, şəfqətlisən, mərhəmətlisən! "** [159] [160]"

**25. İnsanın özünü çətinliyə salaraq duasını qafiyə ilə deməməsi**

Dua edərkən dua edənin özünü çətinliyə salaraq duasını qafiyə ilə deməsi məkruh olan əməldir. Çünki bunu nə Peyğəmbər

---

158 - Buxari, 6010.

159 - 59) "əl-Həşr" - 10.

160 - "Fəthu-l-Bəri", 6010.

*(sallallahu aleyhi va əlihi va səlləm)*, nədə ki, səhabələri etmişlər. Ona görə də ibn Abbas *(radiyallahu anhu)* demişdir: "Qafiyə ili dua etməyi tərk et. Həqiqətən də, mən Peyğəmbərin *(sallallahu aleyhi va əlihi va səlləm)* və səhabələrinin onu tərk etdiklərini gördüm."[161]

İbn Həcər *(rahiməhullah)* bunun şərhində demişdir: "Yəni qafiyəni qəsdən edərək fikrini onunla məşğul etmə. Çünki belə edərək (özünü) çətinliyə salmağın dua edərkən tələb olunan xuşuya mane olur. "[162]

Əgər dua edərkən insan özünü çətinliyə salaraq və məcbur edərək sözlərin axırını qafiyə ilə gətirmək istəyirsə, belə etmək insanı ixlasdan, xuşudan və qəlbini və zehnini bir yerə cəm edib Allah-təalaya boyun əyərək dua etməsindən yayındırdığı üçün bəyənilmir. Lakin dua edənin özünü qafiyə gətirməyə məcbur etmədən, özündən asılı olmayaraq qafiyə ilə dediyi duasına heç bir maneə yoxdur.

Sifərini *(rahiməhullah)* demişdir: "Dua çətinlik çəkərək qafiyə ilə deyilməz. Çünki o qəlbi məşğul edir və xuşunu aparır. Lakin özünün, yaxud başqasının qafiyə ilə etdiyi duasını əzbərləyərək özünü qafiyə demək üçün çətinliyə salmadan etdiyi duası qadağan deyildir".[163]

Necə ki, qafiyə ilə edilən dualara "Qurani-Kərim"də və Peyğəmbərin *(sallallahu aleyhi va əlihi va səlləm)* etdiyi dualarda rast gəlmək olur.

### 26. Allah-təalaya hər bir kiçik və böyük işlərdə dua edərək, Ondan kömək istəmək

İnsanların bir çoxları bu məsələdən qafildirlər. Zənn edirlər ki, insan Allaha yalnız şiddət və çətinlik anlarında dua etməlidir. Lakin bu heç də belə deyildir. Əksinə, müsəlman öz Rəbbinə hər

---

[161] - Buxari, 6337.
[162] - "Fəthu-l-Bari", 6337.
[163] - "Ğizəu-l-əlbəb", 1/409.

bir kiçik və böyük işlərində dua edərək Ondan kömək istəməlidir. Peyğəmbərimiz *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Allahdan hər bir şeyi istəyin, hətta ayaqqabının ipini (qırılarsa) belə. Həqiqətən, Allah-təala onu asanlaşdırmasaydı, asanlaşmazdı. "***[164]

**27. Duadan öncə günahlardan tövbə etmək**

Həqiqətən də, dua etməyin ədəblərindən və qəbul olmasının səbəblərindən biri də qulun duadan əvvəl günahlarını etiraf edib, etdiyi xətalarına peşmançılıq çəkərək Rəbbinə səmimi qəlbdən tövbə etməsidir. Çünki günahların çox olması duanın qəbul olmasına mane olur. [165] Necə ki, Yəhya ibn Muaz ər-Razi *(rahiməhullah)* demişdir: "Dua etdikdə Onun gecikdiyini demə! Çünki sən artıq Onun yollarına günahlarınla sədd çəkmisən."[166]

Ona görə də kim Allah-təalanın onun duasını qəbul etməsini istəyirsə, Allah-təalaya səmimi qəlbdən tövbə edərək haram etdiyi şeylərdən çəkinməli və əmr etdiyi şeyləri isə yerinə yetirməlidir.

Allah-təala buyurmuşdur:

﴿وَإِذَا سَأَلَكَ عِبَادِي عَنِّي فَإِنِّي قَرِيبٌ أُجِيبُ دَعْوَةَ الدَّاعِ إِذَا دَعَانِ فَلْيَسْتَجِيبُوا لِي وَلْيُؤْمِنُوا بِي لَعَلَّهُمْ يَرْشُدُونَ﴾

**"(Ya Rəsulum!) Bəndələrim Məni səndən soruşduqda (söylə ki,) Mən (onlara) yaxınam. Dua edib Məni çağıranın duasını qəbul edərəm. Gərək onlar da Mənim çağırışımı qəbul edib**

---

164 - ət-Tirmizi 4/92 Albani zəifləşdirmişdir, "əd-daifə" 1362, Lakin hədis Aişənin sözü olaraq səhihdir

165 - Bax: səh, 16.

166 - "əl-Beyhəqi", 2/54.

**Mənə iman gətirsinlər. Bununla da, ola bilsin ki, doğru yola yetişsinlər.** [167]

Artıq Allahın Peyğəmbərləri və Rəsulları öz ümmətlərini Allaha tövbə edərək Ondan günahlarının bağışlanmasını diləməyə çağıraraq bəyan edirdilər ki, belə etmək duanın qəbul olmasına, yağışların yağmasına, xeyir-bərəkətin, mal-dövlətin və oğul-uşağın artmasına səbəb olur.

Allah-təala Nuhun *(aleyhissələm)* öz qövmünə belə dediyini buyurmuşdur:

﴿فَقُلْتُ اسْتَغْفِرُوا رَبَّكُمْ إِنَّهُ كَانَ غَفَّارًا . يُرْسِلِ السَّمَاء عَلَيْكُم مِّدْرَارًا . وَيُمْدِدْكُمْ بِأَمْوَالٍ وَبَنِينَ وَيَجْعَل لَّكُمْ جَنَّاتٍ وَيَجْعَل لَّكُمْ أَنْهَارًا﴾

**“Və dedim: “(Tövbə edib) Rəbbinizdən bağışlanmağınızı diləyin. Çünki O, (tövbə edən bəndəsinin günahlarını) çox bağışlayandır!**

**O, sizə göydən bol yağış göndərər;**

**O, sizə mal-dövlət, oğul-uşaq əta edər. O sizin üçün bağlar-bağçalar yaradır və çaylar axıdar!”** [168]

Hudun *(aleyhissələm)* da öz qövmünə belə dediyini buyurmuşdur:

﴿وَيَا قَوْمِ اسْتَغْفِرُواْ رَبَّكُمْ ثُمَّ تُوبُواْ إِلَيْهِ يُرْسِلِ السَّمَاء عَلَيْكُم مِّدْرَارًا وَيَزِدْكُمْ قُوَّةً إِلَى قُوَّتِكُمْ وَلاَ تَتَوَلَّوْاْ مُجْرِمِينَ﴾

**“Ey camaatım! Rəbbinizdən bağışlanmanızı diləyin. Sonra Ona tövbə edin ki, göydən sizə bollu yağış göndərsin, qüvvətinizin üstünə bir qüvvət də artırsın. (Mənim dəvətimdən və imandan) günahkar olaraq üz çevirməyin!”** [169]

İbn Sabih demişdir: “Bir kişi Həsən əl-Basriyə quraqlıqdan şikayət edir. Həsən əl-Bəsri ona deyir: - Allahdan bağışlanma dilə.

---

[167] - 2) “əl-Bəqərə” - 186.

[168] - 71) “Nuh” - 10-12

[169] - 11) “Hud” - 52

Başqa birisi ona deyir ki, Allaha dua et, mənə övlad versin. Həsən əl-Bəsri ona da Allahdan bağışlanma diləməsini deyir. Biz ondan bu haqda soruşduqda o dedi: Mən özümdən heç bir şey demədim. Allah-təala "Nuh" surəsində Nuh peyğəmbərin dilindən buyurmuşdur:

﴿فَقُلْتُ اسْتَغْفِرُوا رَبَّكُمْ إِنَّهُ كَانَ غَفَّارًا . يُرْسِلِ السَّمَاء عَلَيْكُم مِّدْرَارًا . وَيُمْدِدْكُمْ بِأَمْوَالٍ وَبَنِينَ وَيَجْعَل لَّكُمْ جَنَّاتٍ وَيَجْعَل . لَّكُمْ أَنْهَارًا﴾

**"Və dedim: (Tövbə edib) Rəbbinizdən bağışlanmağınızı diləyin. Çünki O, (tövbə edən bəndəsinin günahlarını) çox bağışlayandır! O, sizə göydən bol yağış göndərər. O, sizə mal-dövlət, oğul-uşaq əta edər. O sizin üçün bağlar-bağçalar yaradır və çaylar axıdar!"**[170] .[171]

**28. Duanı dinləyənin duadan sonra amin deməsi**

Amin sözünün mənası "Allahım, qəbul et" və ya "cavab ver" deməkdir.

Duaya amin deyən dua etmiş kimidir. Necə ki, Musa və Harun (aleyhiməssələm) Firona bəd dua etdikləri zaman Allah-təala buyurmuşdur:

﴿قَالَ قَدْ أُجِيبَت دَّعْوَتُكُمَا فَاسْتَقِيمَا وَلاَ تَتَّبِعَآنِّ سَبِيلَ الَّذِينَ لاَ يَعْلَمُونَ﴾

**"(Allah) buyurdu: "Hər ikinizin duasını qəbul etdim. Siz (öz dəvətinizdə və təbliğinizdə) sabitqədəm olun və cahillərin yoluna uymayın!"**[172]

İbn Kəsir *(rahiməhullah)* demişdir: "Musa *(aleyhissələm)* dua edərkən, Harun *(aleyhissələm)* amin deyirdi." [173]

---

[170] - Abdu-r-Razzəq, "əl-Musannəf", 3/87, Tabərani, 964.

[171] - 71) "Nuh" - 10-12

[172] - "Yunus" – 89.

[173] - "Təfsiru-l-Qurani-l-azim", 2/411.

Ayədən göründüyü kimi Allah-təala Musa peyğəmbər dua edərkən Harun peyğəmbərin amin deməsinə baxmayaraq ikisinə də **“Hər ikinizin duasını qəbul etdim”** buyuraraq Harun peyğəmbəri də dua edən adlandırmışdır.

## DUA QƏBUL OLAN VAXTLAR, YERLƏR VƏ HALLAR

Allah-təala öz qullarını Ona dua etməyə çağıraraq dua üçün onlara rəhmət olaraq müəyyən vaxtlar qoymuşdur və həmin anlarda Ona edilən dualara cavab verəcəyinə vəd vermişdir. Həmin vaxtlar bunlardır:

**1. Azan verilərkən**

Səhl ibn Sad əs-Saididən *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"İki şey vardır ki, geri qaytarılmaz. Yaxud çox az hallarda olar ki, geri qaytarılar: Azan verilərkən və döyüş zamanı iki ordunun bir-biri ilə üzləşərək döyüşdükləri an edilən dua."***[174].

**2. Azan və iqamə arasında edilən dua**

Ənəs ibn Malikdən *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Azan və iqamə arasında edilən dua geri qaytarılmır.Ona görə də dua edin"*** [175]

**3. Səcdədə olarkən edilən dua**

Qul namaz qılarkən səcdədə olduğu vaxt Rəbbinə daha da yaxın olur. Ona görə də səcdə halında olarkən duanı çoxaltmalıdır.

Əbu Hureyrədən *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Qulun Rəbbinə ən yaxın olduğu vaxt səcdədə olduğu andır. (Ona görə də) duanı çoxaldın."*** [176].

---

[174] - əbu Davud, 2540, Albani səhihləşdirmişdir, "Sahihu-l-cəmi", 3079.

[175] - əbu Davud, 521, Albani səhihləşdirmişdir. "Sahihu-l-cəmi", 3408.

[176] - Müslim, 482; əbu Davud, 875.

İbn Abbasdan *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Bilin ki, mən rukuda, yaxud səcdədə olarkən "Quran" oxumaqdan qadağan olundum. Rukuda Rəbbinizə təzim edin (subhənə rabbiyəl azim deyin). Səcdədə isə çoxlu dua edin. (Çünki siz səcdədə olarkən etdiyiniz duanızın) qəbul olmasına layiqsiniz."***[177]

**4. Fərz namazlarının axırında salamdan öncə edilən dua**

Əbu Umamə əl-Bəhilidən *(radiyallahu anhu)* rəvayət olunan hədisdə demişdir:

***"Deyildi: "Ey Allahın Rəsulu, hansı dua daha tez eşidilir?" Peyğəmbər (sallallahu aleyhi va əlihi va səlləm) dedi: "Gecənin axırıncı üçdə birində və Fərz namazlarının axırında [edilən dua]."*** [178].

Həmçinin, Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* Muaz ibn Cəbələ hər namazın axırında

***"Allahım, sənə zikr, şükür və gözəl ibadət etməkdə mənə yardım et" - deməsini buyurmuşdur.***[179]

**5. Nafilə namazların axırıncı təşəhhüdündə Peyğəmbərə *(sallallahu aleyhi va əlihi va səlləm)* salavat gətirdikdən sonra**

İbn Məsuddan *(radiyallahu anhu)* rəvayət olunan hədisdə demişdir:

***"Mən namaz qılırdım. Əbu Bəkr və Ömər (radiyallahu anhumə) Peyğəmbərlə (sallallahu aleyhi va əlihi va səlləm) birlikdə idilər. O vaxt ki, oturub Allah-təalaya həmd-səna, Peyğəmbərə (sallallahu aleyhi va əlihi va səlləm) salavat gətirdim və sonra özüm üçün dua etdim, Peyğəmbər (sallallahu aleyhi va əlihi va səlləm) dedi: - İstə, [istəyin] verilər, istə, [istəyin] verilər."*** [180]

---

[177] - Müslim, 479.

[178] - Albani həsənləşdirmişdir, "Sahihu sunəni-t-Tirmizi", 2782.

[179] - Albani səhihləşdirmişdir, "Sahihu sunəni əbi Davud", 1347.

[180] - Tirmizi, 593, Albani həsənləşdirmişdir, "Təxricu-l-Mişkət", 931.

**6. Gecənin axırıncı üçdə birində edilən dua**

Əbu Hureyrədən *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* demişdir:

***"Rəbbimiz hər gecə dünya səmasına enər və gecənin axırıncı üçdə biri olduğu vaxt deyər: - Mənə dua edən bir kimsə varmı onun duasını qəbul edəm?! Məndən istəyən bir kimsə varmı onun dilədiyini verəm?! Məndən bağışlanma diləyən bir kimsə varmı onu bağışlayam?! "***[181]

**7. Cümə günü edilən dua**

Əbu Hureyrədən *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* demişdir:

***"Cümə günündə elə bir an vardır ki, hər bir müsəlman o ana müvafiq olaraq Allahdan xeyir istəyərsə, Allah-təala onun istəyini verər. Həmin an az bir andır."***[182]

Cümə günündə olan həmin anın hansı vaxtda olması barədə alimlərin müxtəlif rəyləri vardır. Lakin ən güclüsü və dəlilə daha yaxın olanı iki rəydir.

**Birincisi:** İmamın minbərdə oturduğu vaxtla namazı qılıb bitirdiyi vaxt arasında olan andır.

Əbu Burdə ibn əbi Musa əl-Əşaridən Abdullah ibn Ömərin *(radiyallahu anhum)* ona belə dediyi rəvayət olunur:

***"Atanın Peyğəmbərdən (sallallahu aleyhi va əlihi va səlləm) Cümə günündə olan o an barədə bir şey söylədiyini eşitdinmi? Dedi: - Bəli, onun belə dediyini eşitdim. Eşitdim ki, Peyğəmbər (sallallahu aleyhi va əlihi va səlləm) deyir: - O [an] imam minbərdə oturduğu vaxtla namaz bitənə qədər olan vaxt arasındadır."***[183]

---

181 - Buxari. 1145; Müslim, 758.

182 - Buxari, 935; Müslim, 1970.

183 - Buxari, 853.

**İkincisi:** Əsr vaxtından günəş batana qədər olan andır.

Abdullah ibn Salamdan *(radiyallahu anhu)* rəvayət olunan hədisdə demişdir:

***"Peyğəmbər** (sallallahu aleyhi va əlihi va səlləm) **[yanımızda] oturmuşdu. Mən dedim: - Biz Allahın kitabında, yəni ["Tövrat"da] belə yazıldığını görürük. Cümə günündə elə bir saat vardır ki, hər bir mömin qul, o saata müvafiq olaraq namaz qılar və Allah-təaladan bir şey istəyərsə, Allah-təala onun ehtiyacını ödəyər. Peyğəmbər** (sallallahu aleyhi va əlihi va səlləm) **mənə işarə etdi ki, əksinə saatın bir anı. Dedim: - Doğru söylədin, ya Rəsulullah, əksinə, saatın bir anı. Sonra dedim: - O hansı saatdır? Peyğəmbər** (sallallahu aleyhi va əlihi va səlləm) **dedi: - O gündüzün saatlarından olan ən axırıncı saatdır. Dedim: - O vaxt namaz vaxtı deyildir axı? Peyğəmbər** (sallallahu aleyhi va əlihi va səlləm) **dedi: - Bəli. həqiqətən, mömin bir qul namaz qılar və yalnız növbəti namazı gözləmək üçün oturarsa, o, namazın içində olmuş kimi sayılar."***[184]

İbn Həcər *(rahiməhullah)* rəyləri zikr etdikdən sonra demişdir: "Şübhə yoxdur ki, xatırlanan rəylərin ən düzgünü əbu Musanın hədisi ilə Abdullah ibn Salamın hədisidir." [185]

İbnu-l-Qayyim *(rahiməhullah)* ikinci rəyin daha düzgün olduğunu deyərək Abdullah ibn Salamın *(radiyallahu anhu)* keçən hədisini və bu fəsildə olan digər hədisləri dəlil gətirmişdir.[186]

**8. Ramazan ayında edilən dua**

Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Ramazanda rəhmət qapıları açılar, Cəhənnəm qapıları bağlanar və Şeytanlar zəncirlənərlər."*** [187]

Həmçinin, buyurmuşdur:

---

[184] - Əhməd. 5/451, İbn Həcər səhihləşdirmişdir. "Nətəicu-l-əfkar", 2/410.

[185] - "Fəthu-l-Bəri", 2/421.

[186] - "Zədu-l-Məad", 1/390-391.

[187] - Buxari. 1899; Müslim, 1079.

***"Ramazanda dua edən hər bir müsəlmanın qəbul olunan duası vardır."***[188]

**9. Qədr gecəsi edilən dua**

Möminlərin anası Aişənin (radiyallahu anhə) belə dediyi rəvayət olunmuşdur:

***"Dedim, ey Allahın Rəsulu, Qədr gecəsinin hansı gecənin olduğunu bilsəm, nə deyim? Dedi: "De ki, Allahım, həqiqətən, Sən bağışlayansan və bağışlamağı sevirsən. Məni bağışla. ""*** [189]

Şeyx Abdullah əl-Bassam *(rahiməhullah)* demişdir: "Möminlərin anası (radiyallahu anhə) o gecədə ən üstün duanı deməyə həris olduğundan və həqiqətən də, o gecədə duanın eşidildiyini bildiyi üçün Peyğəmbərdən *(sallallahu aleyhi va əlihi va səlləm)* ona əgər Qədr gecəsinin nə vaxt olduğunu bilərsə, ən üstün olan duanı öyrətməsini tələb edir və Peyğəmbər də *(sallallahu aleyhi va əlihi va səlləm)* ona deyəcəyi ən gözəl və ən üstün duanı xəbər verir." [190]

**10. Oruclu olarkən edilən dua**

Ənəsdən *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* demişdir:

***"Üç dua vardır ki, geri qaytarılmır: Atanın, oruclunun və müsafirin duası."*** [191]

**11. Hacda və ümrədə olarkən edilən dua**

Abdullah ibn Ömərdən (radiyallahu anhumə) rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Allah yolunda düşmənə hücuma keçən, hac və ümrə üçün yola çıxan Allahın qonağıdır. Allah onları çağırmışdır və onlar da***

---

[188] - əl-Bəzzar. "Kəşfu-l-əctər", 962, Albani səhihləşdirmişdir. "Sahihu-t-tərğib va-t-tərhib", 1/419.

[189] - Tirmizi, 3513, Albani səhihləşdirmişdir, "Sahihu-l-cəmi", 4423.

[190] - "Tovdihu-l-əhkəm", 3/592.

[191] - əl-Beyhəqi, 3/345, Albani səhihləşdirmişdir. "əs-sahihə", 1797.

***Allahın çağırışına cavab vermişlər. Onlar Allahdan istəyərlər [Allah da onların istəyini] verər."*** [192]

## 12-13. Səfa və Mərva dağının üzərində olarkən edilən dua

Cabirdən *(radiyallahu anhu)* rəvayət olunan hədisdə buyurmuşdur:

***"Peyğəmbər (sallallahu aleyhi va əlihi va səlləm) Səfa dağının üzərində durarkən üç dəfə təkbir (Allahu Əkbər) gətirər və deyərdi: "Allahdan başqa ibadət olunmağa haqqı olan məbud yoxdur. O, təkdir heç bir şəriki yoxdur..." Bunları üç dəfə deyər və [aralarında] dua edərdi. Həmçinin, Mərva dağının üstündə də belə edərdi."*** [193]

## 14. Arafat günündə edilən dua

Ən üstün olan dua Arafat günündə edilən duadır. Çünki o gün duaların qəbul olunan günüdür. Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Ən xeyirli dua Arafat günündə edilən duadır."*** [194]

## 15. Müzdəlifədə olarkən

Allah-təala buyurmuşdur:

﴿لَيْسَ عَلَيْكُمْ جُنَاحٌ أَن تَبْتَغُواْ فَضْلاً مِّن رَّبِّكُمْ فَإِذَا أَفَضْتُم مِّنْ عَرَفَاتٍ فَاذْكُرُواْ اللّهَ عِندَ الْمَشْعَرِ الْحَرَامِ وَاذْكُرُوهُ كَمَا هَدَاكُمْ وَإِن كُنتُم مِّن قَبْلِهِ لَمِنَ الضَّآلِّينَ﴾

**"(Həcc mövsümündə) Rəbbinizdən (ticarətlə) ruzi diləməniz sizin üçün günah deyildir. Arafatdan qayıdarkən Məşərül haramda (müzdəlifədə) Allahı xatırlayın. Sizi doğru yola**

---

192 - İbn Macə, 2893, Albani səhihləşdirmişdir. "Əs-sahihə", 1820.

193 - Müslim, 1218.

194 - Tirmizi, 3585, Albani həsənləşdirmişdir. "Sahihu-l-cəmi", 3274.

**yönəltdiyi üçün Onu yada salın (Ona dua edin), çünki siz bundan əvvəl (doğru yolu) azanlardan idiniz!"[195]**

Həmçinin, Cabirdən *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbərin *(sallallahu aleyhi va əlihi va səlləm)* necə həcc etdiyi barədə deyir:

***"Peyğəmbər (sallallahu aleyhi va əlihi va səlləm) dəvəyə minərək Müzdəlifəyə gəlib, qibləyə çevrildi. Allaha dua edərək, təkbir və təhlil[196] gətirərək hava açılana qədər ayaq üstə dua etməkdə davam etdi."*** [197]

**16-17. Kiçik və Orta daşa daş atdıqdan sonra**

Səlim ibn Abdullahdan belə rəvayət olunur:

***"Abdullah ibn Ömər (radiyallahu anhumə) Kiçik daşa yeddi daş atdıqdan sonra qibləyə tərəf yönələr, əlini qaldıraraq dua edər, Orta daşa daş atdıqdan sonra da eyni hərəkətləri edər, lakin Böyük daşa daş atdıqdan sonra dua etməz və Peyğəmbərin (sallallahu aleyhi va əlihi va səlləm) belə etdiyini söyləyərdi."*** [198]

Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* həcc edərkən adı çəkilən bu altı yerdə, yəni Səfa və Mərva dağının üzərində, Arafat dağında, Müzdəlifədə və Kiçik və Orta daşa daş atdıqdan sonra, yanında duraraq qibləyə tərəf yönələr və əllərini qaldıraraq dua edərdi.

**18. Zəm-zəm suyunu içərkən edilən dua**

Cabirdən *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Zəm-zəm suyunu içərkən edilən dua qəbuldur."***[199]

**19. Yağış yağarkən edilən dua**

Səhl ibn Saddan *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

---

[195] -2) "əl-Bəqərə" - 198.

[196] - Lə iləhə illəllah deməyə təhlil deyilir.

[197] - Müslim, 1218.

[198] - Buxari, 1752. (ixtisarla).

[199] - Əhməd, 3/357, Albani səhihləşdirmişdir. "Sahihu-l-cəmi", 5502.

***“İki dua vardır ki, geri qaytarılmaz: Azan verilərkən və yağış yağarkən.”*** [200]

**20. Xoruz banlayan zaman**

Əbu Hureyrədən *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***“Xoruzların banlamağını eşitdiyiniz zaman Allahın fəzilətindən istəyin [Ona dua edin]. Çünki onlar mələk görmüşlər”***[201]**.**

Nəvəvi *(rahiməhullah)* demişdir: “Qazi demişdir ki, xoruz banlayarkən dua etməkdə məqsəd mələklərin duaya şahidlik etməsi və amin deməsidir...” [202]

**21. Qəlbin Allaha tərəf yönəldiyi və ixlasın artdığı vaxt**

Bəzən insan imanının daha da artdığını, qəlbinin Allaha tərəf daha da çox yönəldiyini hiss edir. Şübhəsiz ki, belə bir anlarda edilən dua səmimi qəlbdən olduğu üçün daha da qüvvətli olur. Ona görə də hər bir müsəlman həmin fürsətlərdən istifadə edərək, Rəbbinə dua etməyi çoxaltmalıdır.

**22. Çətinlikdə və darda qalanın duası**

Allah-təala buyurmuşdur:

﴿أَمَّن يُجِيبُ الْمُضْطَرَّ إِذَا دَعَاهُ وَيَكْشِفُ السُّوءَ وَيَجْعَلُكُمْ خُلَفَاءَ الْأَرْضِ أَإِلَٰهٌ مَّعَ اللَّهِ قَلِيلًا مَّا تَذَكَّرُونَ﴾

**“(Allahdan qeyri ibadət etdikləriniz yaxşıdır) Yaxud əli hər yerdən üzülüb darda qalan bir kimsə, ona dua etdiyi zaman onun duasını qəbul buyuran [sizdən] şəri sovuşduran, sizi yer**

---

200 - əbu Davud, 3540, Albani həsənləşdirmişdir. “Sahihu-l-cəmi”, 3078.

201 - Buxari, 3304; Müslim, 2729.

202 - “Şərhu sahihi Muslim”, 17/49.

**üzünün varisləri edən kəs? Məgər Allahla yanaşı başqa bir (ibadətə layiq) İlahmı var? Siz nə az düşünüb daşınırsınız!** [203]

Böyük təfsir alimi Qurtubi *(rahiməhullah)* ayənin şərhində demişdir: “Allah-təala Özündən xəbər verərək çətinlikdə olanın Ona dua etdiyi zaman duasını qəbul edəcəyinə zəmanət vermişdir.” [204]

**23. Məzlumun duası**

Necə ki, Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* Muazı *(radiyallahu anhu)* Yəmənə göndərdiyi zaman demişdir:

***“Məzlumun duasından qorx! [çəkin] Çünki onun duası ilə Allah arasında heç bir pərdə yoxdur.”*** [205]

Həmçinin, Əbu Hureyrədən *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

*“**Məzlumumun duası qəbuldur, hətta, facir [günahkar] olsa belə günahı öz üzərinədir. ”***[206]

**24. Valideynin övladına etdiyi bəd-dua**

Əbu Hureyrədən *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***“Üç dua vardır ki, qəbuldur. Onların qəbul olmasına heç bir şübhə yoxdur: Məzlumun duası, müsafirin duası və valideynin övladına etdiyi bəd dua.”***[207]

**25. Valideynin övladına etdiyi dua**

Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

*“**Üç dua vardır ki, geri qaytarılmır: Valideynin övladına etdiyi dua, oruclunun və müsafirin duası”.***[208]

---

[203] -27) “ən-Nəml” - 62.

[204] - “əl-Cəmiu li əhkəmi-l-Quran”, 13/223.

[205] - Buxari, 1469; Müslim, 19.

[206] - Əhməd, 2/367, Albani həsənləşdirmişdir, “Sahihu-l-cəmi”, 3382.

[207]- əbu Davud, 1535, Albani səhihləşdirmişdir. “Sahihu-l-ədəbi-l-mufrad”, 372.

[208] - əl-Beyhəqi, 3/345, Albani səhihləşdirmişdir, “Sahihu-l-cəmi”, 2032.

**26. Müsafirin duası**

Ötən hədisə görə.

**27. Saleh övladın ata-anasına etdiyi duası**

Əbu Hureyrədən *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"İnsan öldükdən sonra [savab qazanmaq üçün etdiyi] əməli kəsilər. Yalnız üç şeydən - [qoyub getdiyi] daimi sədəqədən [tikdiyi məscid, məktəb, bulaq, əkdiyi ağac və s.], mənfəət qazanılan elmindən və yaxud saleh övladının onun üçün etdiyi duasından – başqa."*** [209]

**28. Xəstənin, yaxud ölünün yanında olarkən**

Ummu Sələmədən (radiyallahu anhə) rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Xəstənin, yaxud ölünün yanında olduğunuz zaman xeyir söyləyin (onun üçün dua edin və bağışlanma diləyin). Çünki mələklər sizin söylədiklərinizə amin deyirlər..."*** [210]

**29. Gecə yuxudan oyanarkən**

Ubadə ibn əs-Samitdən *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Kim gecə yuxudan oyanar və - Lə iləhə illəllah, vahdəhu lə şərikə ləh, ləhu-l-mulku va ləhu-l-həmdu va huva alə kulli şeyin qadir. Əlhəmdu lilləh, va subhənallah va lə iləhə illəllah, vallahu əkbar, va lə haulə va lə quvvatə illə billəh - (O təkdir və şəriki yoxdur, mülk və həmd ona məxsusdur, O hər şeyə qadirdir, Allaha həmd olsun, O bütün nöqsanlardan pakdır, Ondan başqa ibadət olunmağa layiq olan ilah yoxdur, Allah böyükdür, güc və qüvvət də yalnız Onunladır) –dedikdən sonra deyərsə "Allahım, məni***

---

[209] - Müslim, 1631; əbu Davud, 2880.

[210] - Müslim, 919; əbu Davud, 3115.

***bağışla", - yaxud dua edərsə bağışlanar və duası qəbul olar. Əgər dəstəmaz alar və namaz qılarsa, namazı qəbul olar. "*** [211]

**30. Yunis peyğəmbərin *(aleyhissələm)* duasından sonra edilən dua**

Sad ibn əbu Vaqqasdan *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Balıq sahibinin [Yunis peyğəmbərin] balığın qarnında olarkən etdiyi duası budur: Lə iləhə illə əntə subhənəkə inni kuntu minə-z-zalimin. (Səndən başqa ibadətə layiq heç bir ilah yoxdur. Sən pak və müqəddəssən! Mən isə, həqiqətən, zalımlardanam (əmrinə qarşı çıxaraq özümə zülm edənlərdənəm.) Əgər bir müsəlman istədiyini bu dua ilə edərsə, Allah-təala onun duasını mütləq qəbul edər."*** [212]

Allah-təala Zün-Nun (balıq sahibi) Yunis peyğəmbər *(aleyhissələm)* haqqında buyurmuşdur:

﴿وَذَا النُّونِ إِذ ذَّهَبَ مُغَاضِبًا فَظَنَّ أَن لَّن نَّقْدِرَ عَلَيْهِ فَنَادَى فِي الظُّلُمَاتِ أَن لَّا إِلَهَ إِلَّا أَنتَ سُبْحَانَكَ إِنِّي كُنتُ مِنَ الظَّالِمِينَ. فَاسْتَجَبْنَا لَهُ وَنَجَّيْنَاهُ مِنَ الْغَمِّ وَكَذَلِكَ نُنجِي الْمُؤْمِنِينَ﴾

**"Zün-Nunu (balıq sahibi Yunisi) da xatırla! Bir zaman o (küfr etməkdə həddi aşmış ümmətinə qarşı) qəzəblənərək çıxıb getmiş və (Bizə xoş gəlməyən bu səbrsizliyinə görə) onu möhnətə düçar etməyəcəyimizi güman etmişdi. Amma sonra qaranlıqlar içində (balığın qarnında gecənin, yaxud dənizin zülmətində) "(Pərvərdigara!) Səndən başqa ibadətə layiq heç bir haqq məbud yoxdur. Sən paksan, müqəddəssən! Mən isə, həqiqətən, zalımlardan olmuşam (əmrinə qarşı çıxaraq özümə zülm eləmişəm)",- deyib dua etmişdi.**

**Biz onun (Yunisin) duasını qəbul buyurduq və (balığın qarnından çıxartmaqla) onu qəmdən qurtardıq. Biz, Həmçinin, möminlərə də belə nicat verərik! "**[213]

---

[211] - Buxari, 1154.

[212] - Tirmizi, 3505, Albani səhihləşdirmişdir. "Sahihu-l-cəmi", 3383.

[213] - "ən-Ənbiyə" - 87-88.

Qurtubi *(rahiməhullah)* bu ayənin təfsirində demişdir: "Bu ayədəki xəbər ilə Allah-təala Ona dua edənə, Yunis peyğəmbərə cavab verdiyi kimi cavab verəcəyinə və onu çətinlikdən qurtardığı kimi dua edəni də çətinlikdən qurtaracağına vəd verərək buyurmuşdur:

"**Biz, həmçinin, möminlərə də belə nicat verərik!**" [214]

İbn Kəsir *(rahiməhullah)* Allah-təalanın: "**Biz, həmçinin, möminlərə də belə nicat verərik!"** - ayəsini təfsir edərək demişdir: "Yəni əgər çətinlikdə olarlarsa və bizə tərəf dönərək dua edərlərsə, xüsusi ilə də darda olarkən, bu duanı edərlərsə (onlara da nicat verərək çətinlikdən və dardan xilas edərik). Necə ki, Peyğəmbərdən *(sallallahu aleyhi va əlihi va səlləm)* həmin duanı etməyimiz üçün bizə tövsiyəsi varid olmuşdur."[215]

**31. Müsibət və xoşa gəlməyən hadisə baş verərkən bu duanı etmək**

Ummu Sələmənin (radiyallahu anhə) Peyğəmbərdən *(sallallahu aleyhi va əlihi va səlləm)* belə eşitdiyi rəvayət olunmuşdur:

***"Əgər bir müsəlmana müsibət baş verərsə və Allah-təala ona əmr etdiyini: - İnnə lilləhi va innə ileyhi raciun. Allahummə, əcirni fi musibəti vaxluf li xayran minhə - Həqiqətən də, biz Allahınıq və ona tərəf də qayıdacağıq. Ey Allahım, mənə bu müsibətə görə əcr ver və ondan xeyirlisini mənə əvəz et - deyərsə, Allah-təala mütləq ona müsibətindən xeyirlisinin əvəzini verər."[216].***

Necə ki, Allah-təala buyurmuşdur:

---

214 - "əl-Cəmiu li əhkəmi -l- Quran", 11/334.

215 - "Təfsiru-l-Qurani-l-azim", 3/187.

216 - Müslim, 918; əbu Davud, 3119.

﴿وَلَنَبْلُوَنَّكُمْ بِشَيْءٍ مِّنَ الْخَوفْ وَالْجُوعِ وَنَقْصٍ مِّنَ الأَمَوَالِ وَالأنفُسِ وَالثَّمَرَاتِ وَبَشِّرِ الصَّابِرِينَ. الَّذِينَ إِذَا أَصَابَتْهُم مُّصِيبَةٌ قَالُواْ إِنَّا لِلّهِ وَإِنَّا إِلَيْهِ رَاجِعونَ. أُولَـئِكَ عَلَيْهِمْ صَلَوَاتٌ مِّن رَّبِّهِمْ وَرَحْمَةٌ وَأُولَـئِكَ هُمُ الْمُهْتَدُونَ﴾

**“Əlbəttə, Biz sizi bir az qorxu, bir az aclıq, bir az da mal, can (övlad) və məhsul qıtlığı ilə imtahan edərik. (Ya Rəsulum! Belə imtahanlara) səbr edən şəxslərə müjdə ver!**

**O kəslər ki, başlarına bir müsibət gəldiyi zaman “Biz Allahınıq (Allahın bəndələriyik) və (ölәndən sonra) Ona tərəf (Onun dərgahına) qayıdacağıq!” – deyərlər, onları Rəbbi tərəfindən bağışlanmaq və rəhmət (Cənnət) gözləyir. Onlar doğru yolda olanlardır!”** [217]

### 32. Allahı ən böyük adı ilə çağıraraq dua etmək

Ənəs ibn Malik *(radiyallahu anhu)* deyir ki, mən Peyğəmbərlə *(sallallahu aleyhi va əlihi va səlləm)* oturarkən bir kişi namaz qılaraq bu duanı etdi:

“Ey Allahım, mən yalnız Səndən istəyirəm. Çünki həmd və tərif sənə məxsusdur. Səndən başqa ibadətə layiq məbud yoxdur. Sən çoxlu əta edən və göylərin və yerin yaradıcısısan. Ey əzəmət və kərəm sahibi (səxavətli), ey həmişə diri olub bütün kainatı idarə edən!”

Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* dedi:

***“O, artıq Allahı ən böyük adı ilə çağırdı. Hansı ki, o ad ilə çağırılarsa cavab verər və o ad ilə istənilərsə əta edər.”*** [218]

Həmçinin Əsma bint Yəziddən (radiyallahu anhə) rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***“Allahın ən böyük adı bu iki ayədədir***

---

217 - 2) “əl- Bəqərə” - 155-157.

218 - “Əbu Davud, 1495; Albani səhihləşdirmişdir. “Sahihu sunəni ibn Macə”, 3112.

﴿وَإِلَهُكُمْ إِلَهٌ وَاحِدٌ لَّا إِلَهَ إِلَّا هُوَ الرَّحْمَنُ الرَّحِيمُ﴾

**"Sizin ilahınız bir olan Allahdır, Ondan başqa ibadətə layiq məbud yoxdur. O, rəhmlidir, mərhəmətlidir."** [219]

﴿الم. اللَّهُ لَا إِلَهَ إِلَّا هُوَ الْحَيُّ الْقَيُّومُ﴾

**"Əlif, Ləm, Mim. Allahdan başqa ibadət olunmağa layiq heç bir ilah yoxdur. Həmişə diri olan və kainatı idarə edən Odur."**[220] **"** [221]

Başqa bir hədisdə Əbu Umamədən *(radiyallahu anhu)* Peyğəmbərin *(sallallahu aleyhi va əlihi va səlləm)* belə dediyi rəvayət edilir:

***"Allahın ən böyük adı "Quran"ın üç surəsindədir; "əl-Bəqərə", "Əli İmran" və "Taha" (surəsində)".***

Hədisin rəvayətçilərindən olan Qasim deyir ki, "həmin surələri axtardım və gördüm ki, o ad "əl-Həyyu"(əbədi və həmişə diri olan) "əl- Qayyum" dur (bütün kainatı idarə edən və ya bəndələrinin işini yoluna qoyan). [222]

Həmçinin, Ənəs ibn Malikdən *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Yə zə-l-cələli va-l-ikram (ey əzəmət və kərəm sahibi,) ( sözü) ilə çoxlu dua edin".***[223]

---

[219] - 2) "əl- Bəqərə" – 163.

[220]- 3)"Əli- İmran"- 1-2.

[221] - Əbu davud, 1496; Albani həsənləşdirmişdir. "Sahihu sunəni ibn Macə," 3109.

[222]- İbn Macə, 3856; Albani həsənləşdirmişdir. "Silsilətu-l-əhədisi-s-sahihə", 476.

[223]- Tirmizi, 3525; Albani səhihləşdirmişdir. "Silsilətu-l-əhədisi-s-sahihə", 1536.

## ALLAH-TƏALAYA SIĞINMAQ ÜÇÜN MÜƏYYƏN VAXT, YER VƏ HALLAR

Necə ki, Allah-təalaya müəyyən olan mübarək günlərdə, mələklərin olduğu yerlərdə və gözəl vaxtlarda dua etmək bəyənilir, eləcə də, elə zaman, yer və hallar vardır ki, həmin anlarda Şeytanın və onun hiyləsinin, hər bir zərərvericinin, yaxud da baş verən pis hadisənin şərindən Allaha sığınaraq, Ona pənah aparmaq da bəyənilən işlərdəndir. Həmin anlardan bir neçəsini qeyd etmək yerinə düşərdi:

**1. "Quran" oxumağa başlayarkən**

Allah-təala buyurmuşdur:

﴿فَإِذَا قَرَأْتَ الْقُرْآنَ فَاسْتَعِذْ بِاللّهِ مِنَ الشَّيْطَانِ الرَّجِيمِ﴾

**"(Ya Rəsulum!) Quran oxumaq istədiyin zaman qovulmuş Şeytandan Allaha sığın!"** [224]

**2. Qəzəblənərkən**

Allah-təala buyurmuşdur:

﴿وَإِمَّا يَنزَغَنَّكَ مِنَ الشَّيْطَانِ نَزْغٌ فَاسْتَعِذْ بِاللّهِ إِنَّهُ سَمِيعٌ عَلِيمٌ﴾

**"Əgər sənə Şeytandan bir vəsvəsə gəlsə, (fəsad toxunsa), Allaha sığın. Şübhəsiz ki, Allah (hər şeyi) eşidən və biləndir."** [225]

Suleyman ibn Suraddan *(radiyallahu anhu)* rəvayət olunan hədisdə belə deyir:

***"Biz Peyğəmbərin*** **(sallallahu aleyhi va əlihi va səlləm)** ***yanında oturmuşduq. İki kişi söyüşməyə başladı. Biri qəzəbli və rəngi qızarmış halda o birini söyürdü. Peyğəmbər*** **(sallallahu aleyhi va əlihi va səlləm)** ***dedi: "Mən elə bir kəlmə bilirəm ki, əgər onu kim deyərsə,***

---

[224] - 16) "ən-Nəhl" - 98.

[225] - 7) "əl-Əraf" - 200.

***qəzəbi yox olar. (O kəlmə budur) Əuzu billəhi minə-ş-Şeytani-r-racim - Qovulmuş Şeytandan Allaha sığınıram. ""*** [226]

**3. Namaz qılarkən Şeytan vəsvəsə edərsə**

Osman ibn əbi-l-Asdan *(radiyallahu anhu)* rəvayət olunur ki, o, Peyğəmbərin *(sallallahu aleyhi va əlihi va səlləm)* yanına gələrək dedi:

***"Ey Allahın Rəsulu, Şeytan qiraətimi və namazımı xuşu ilə oxuyub qılmağıma mane olaraq məni çaşdırdı və şəkkə saldı. Peyğəmbər (sallallahu aleyhi va əlihi va səlləm) dedi: - O Xinzəb adlı Şeytandır. Əgər onu hiss edərsənsə ondan Allaha sığın və üç dəfə sol tərəfinə yüngülcə tüpür. [Səhabə] deyir: - Belə etdim və Allah-təala onu məndən uzaqlaşdırdı."*** [227]

**4. Allah barəsində pis fikirdə olarkən**

Əbu Hureyrədən *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Sizdən birinizə Şeytan gələr və deyər: Bunu kim yaratmışdır? Bunu kim yaratmışdır? Hətta, ona deyənə qədər ki, bəs Rəbbini kim yaratmışdır? Əgər gəlib ora çatarsa, Allaha sığınsın və [belə fikirləşməyi] tərk etsin."*** [228]

İmam Nəvəvi *(rahiməhullah)* hədisin bu ləfzini "***Allaha sığınsın və [belə fikirləşməyi] tərk etsin***" şərh edərək demişdir: "Mənası odur ki, əgər ona bu vəsvəsə gələrsə, həmin vəsvəsənin şərini ondan dəf etməsi üçün Allah-təalaya sığınsın və belə fikirləşməkdən üz çevirsin. Bilsin ki, bu Şeytanın vəsvəsəsidir, onu yolundan azdırmaq və fəsad törətmək üçün çalışır..."

---

226 - Buxari, 3282; Müslim, 2610.

227 - "Şərhu sahihi Muslim", 14/411.

228 - Buxari, 6/336; Müslim, 2/334.

**5. Uşaqları Allah-təalaya sığındıraraq ovsunlamaq**

Valideynlər öz övladlarını hər bir zərər verən şeyin (Şeytanın, heyvanın, bədnəzərin və s.) şərindən Allaha sığındırmaları ilə övladlarının Allah-təalanın izni ilə neçə-neçə xəta-bəladan qorunmalarına səbəb ola bilərlər.

Allah-təala Məryəmin (aleyhəssələm) anasının dilindən buyurmuşdur:

﴿فَلَمَّا وَضَعَتْهَا قَالَتْ رَبِّ إِنِّي وَضَعْتُهَا أُنثَى وَاللّهُ أَعْلَمُ بِمَا وَضَعَتْ وَلَيْسَ الذَّكَرُ كَالأُنثَى وَإِنِّي سَمَّيْتُهَا مَرْيَمَ وِإِنِّي أُعِيذُهَا بِكَ وَذُرِّيَّتَهَا مِنَ الشَّيْطَانِ الرَّجِيمِ﴾

**"Onu (bətnindəkini) dünyaya gətirdiyi zaman: "Ey Rəbbim! Mən qız doğdum", - söylədi. Halbuki, Allah onun nə doğduğunu və oğlanın qız kimi olmadığını yaxşı bilirdi. "Mən onun adını Məryəm qoydum, onu və onun nəslini məlun (daşqalaq olunmuş) Şeytandan (Şeytanın şərindən) Sənə tapşırıram" (dedi).**"[229]

***Abdullah ibn Abbasdan rəvayət olunur ki, Peyğəmbər (sallallahu aleyhi va əlihi va səlləm) sevimli nəvələri Həsən və Hüseyni (radiyallahu anhumə) bu dua ilə- Uizukumə bikəlimətilləhi-t-təmməh min kulli Şeytanin va həmməh va min kulli aynin ləmməh. – (Sizi hər bir Şeytan və həşəratın şərindən, hər bir pis gözdən (bədnəzərdən) Allahın tam kəlamlarına sığındırıram) ovsunlayaraq deyərdi:***

***"Atanız İbrahim oğulları İsmayıl və İshaqı onunla ovsunlayardı."[230]***

**6. Ayaq yoluna daxil olarkən**

Ənəsdən *(radiyallahu anhu)* rəvayət olunur ki, Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* ayaq yoluna daxil olarkən deyərdi:

---

[229]- 3)"Əli İmran" - 36.

[230] - Buxari, 1012.

***"Allahummə, inni əuzu bikə minə-l-xubsi va-l-xabəis. - Allahım, erkək və dişi Şeytanlardan Sənə sığınıram. (Yaxud pislikdən və pis əməllərdən Sənə sığınıram)."*** [231]

**7. Uzunqulağın anqırtısını eşidərkən**

Əbu Hureyrədən rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Uzunqulağın anqırtısını eşitdiyiniz zaman Şeytandan Allaha sığının. Çünki o Şeytan görmüşdür. "*** [232]

**8. Axşam vaxtı itlərin hürüşünü eşidərkən**

Cabir ibn Abdullahdan *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Axşam çağı itlərin hürüşünü və uzunqulağın anqırtısını eşitdiyiniz zaman Allaha sığının. Çünki onlar sizin görmədiklərinizi görürlər."*** [233]

**9. Bir yerdə qonaqlayarkən**

Xovlə bint Həkimdən (radiyallahu anhə) rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Kim bir yerdə qonaqladığı zaman bu duanı - Əuzu bi kəliməti-lləhi-t-təmməti min şərri mə xaləq (Allahın yaratdıqlarının şərindən Onun tam kəlamlarına sığınıram) – deyərsə oranı tərk edənə qədər ona heç bir şey zərər vurmaz."*** [234]

Ümumiyyətlə, hər bir müsəlman istədiyi vaxt zərər verən şeyin, xüsusi ilə də insanlardan və cinlərdən olan Şeytanların şərindən, istər namazda, istərsə də namazdan xaricdə bəzi insanların xurafata uyaraq etdikləri kimi gözmuncuğuna, nala,

---

231 - Buxari, 1/242.

232 - Buxari, 6/350.

233 - Əbu Davud, 5/332.

234 - Müslim, 2807.

tikana, daşa, torpağa və.s yox, yalnız Allah-təalaya sığınaraq Ona bel bağlamalıdır. Şübhəsiz ki, kim səmimi qəlbdən Allah-təalaya sığınaraq Ona təvəkkül edərsə, Allah-təalanın onu, həqiqətən də qoruduğunun və neçə-neçə xəta-bəlalardan uzaq etdiyinin şahidi olar.

Allah-təala buyurmuşdur:

﴿إِنَّهُ لَيْسَ لَهُ سُلْطَانٌ عَلَى الَّذِينَ آمَنُواْ وَعَلَى رَبِّهِمْ يَتَوَكَّلُونَ﴾

**“Həqiqətən, iman gətirib yalnız öz Rəbbinə təvəkkül edənlərin üzərində Şeytanın heç bir hökmü yoxdur. ”**[235]

235 -16) “ən-Nəhl” - 99.

## DUA EDƏRKƏN YOL VERİLƏN XƏTALAR

Elə insanlar vardır ki, dua edərkən dində heç bir əsası olmayan müxtəlif xətalara yol verər və özlərinin etdikləri dualarına görə Allah yanında savab qazandıqlarını iddia edərlər. Halbuki, etdikləri əsassız dualar onların savab deyil, əksinə, günah qazanmalarına, hətta, etdikləri dualarında Allaha şərik qoşarlarsa, İslam dinindən belə çıxmalarına səbəb ola bilər. Dua edərkən yol verilən xətalardan bir neçəsi bunlardır:

**1. Allahdan qeyrisinə - ağaca, qəbirə, pirə, daşa, övliyalara, vəfat etmiş saleh insanlara və s. dua edərək onlardan kömək istəmək**

Keçən ayə və hədisdən[236] bizə məlum oldu ki, dua etmək ibadətdir. İbadəti isə Allahdan qeyrisinə etmək isə ən böyük və bağışlanmayan bir günah sayılır ki, buna şirk deyilir. Ona görə də hər şeyin yaradıcısı və hər şeyə qadir olan Allahı qoyaraq Peyğəmbərləri, övliyaları, pirləri, saleh insanları, ölüləri, daşları, ağacları və s. köməyə çağırıb, onlardan yardım istəyərək Allaha şərik qoşmaq olmaz. Çünki Allah-təala Ona şərik qoşanı heç vaxt bağışlamaz.

Allah-təala buyurmuşdur:

﴿إِنَّ اللّهَ لاَ يَغْفِرُ أَن يُشْرَكَ بِهِ وَيَغْفِرُ مَا دُونَ ذَلِكَ لِمَن يَشَاء وَمَن يُشْرِكْ بِاللّهِ فَقَدْ ضَلَّ ضَلاَلاً بَعِيدًا﴾

**“Allah Ona şərik qoşmağı əsla bağışlamaz. Bundan aşağı olan günahları isə istədiyi şəxsə bağışlar. Allaha şərik qoşan şəxs, şübhəsiz ki, (haqq yoldan) çox azmışdır.”**[237]

Bəziləri iddia edirlər ki, Allah-təalanın qadağan etdiyi dua yalnız bütlərə olan duadır. Lakin, bu heç də belə deyildir. Əksinə

---

236 -bax: səh, 7.

237 -5) “ən-Nisə” - 116.

həmin bütlər saleh insanların timsalından başqa bir şey deyildir. Necə ki, Allah-təala buyurmuşdur:

﴿إِنَّ الَّذِينَ تَدْعُونَ مِن دُونِ اللّهِ عِبَادٌ أَمْثَالُكُمْ فَادْعُوهُمْ فَلْيَسْتَجِيبُواْ لَكُمْ إِن كُنتُمْ صَادِقِينَ. أَلَهُمْ أَرْجُلٌ يَمْشُونَ بِهَا أَمْ لَهُمْ أَيْدٍ يَبْطِشُونَ بِهَا أَمْ لَهُمْ أَعْيُنٌ يُبْصِرُونَ بِهَا أَمْ لَهُمْ آذَانٌ يَسْمَعُونَ بِهَا قُلِ ادْعُواْ شُرَكَاءكُمْ ثُمَّ كِيدُونِ فَلاَ تُنظِرُونِ. إِنَّ وَلِيِّيَ اللّهُ الَّذِي نَزَّلَ الْكِتَابَ وَهُوَ يَتَوَلَّى الصَّالِحِينَ. وَالَّذِينَ تَدْعُونَ مِن دُونِهِ لاَ يَسْتَطِيعُونَ نَصْرَكُمْ وَلآ أَنفُسَهُمْ يَنْصُرُونَ﴾

**"Allahdan başqa köməyə çağırdıqlarınız da sizin kimi bəndələrdir. Əgər (onların sizə bir kömək edə biləcəyi barəsindəki iddianızda) doğrusunuzsa, haydı, onları çağırın, sizə cavab versinlər.**

**Məgər onların yeriyən ayaqları, ya tutan əlləri, ya görən gözləri, yaxud eşidən qulaqları var?! De: "Haydı, çağırın şəriklərinizi, mənim barəmdə istədiyiniz hiyləni qurun və mənə heç möhlət də verməyin!**

**(De ki,) Şübhəsiz ki, mənim hamim Kitabı (Quranı) nazil edən Allahdır. O, əməlisalehlərə himayədarlıq edər!**

**Sizin Ondan başqasına dua etdikləriniz isə nə sizə, nə də özlərinə bir köməklik edə bilər!"** [238]

Həmçinin, buyurmuşdur:

﴿وَالَّذِينَ يَدْعُونَ مِن دُونِ اللّهِ لاَ يَخْلُقُونَ شَيْئًا وَهُمْ يُخْلَقُونَ. أَمْواتٌ غَيْرُ أَحْيَاء وَمَا يَشْعُرُونَ أَيَّانَ يُبْعَثُونَ﴾

**"Onların Allahdan qeyri dua etdikləri heç bir şey yarada bilməzlər, əksinə, onlar özləri yaradılırlar.**

**Onlar ölüdürlər, diri deyillər və (insanların, bütün məxluqatın) nə vaxt diriləcəklərini də bilməzlər."** [239]

---

238 -7) "əl-Əraf" - 194-197.

Ayədən məlum olur ki, bir şey yaratmağa qadir olmayan kəs dua edilməyə layiq deyildir.

Həmçinin, buyurmuşdur:

﴿ذَٰلِكُمُ اللَّهُ رَبُّكُمْ لَهُ الْمُلْكُ وَالَّذِينَ تَدْعُونَ مِن دُونِهِ مَا يَمْلِكُونَ مِن قِطْمِيرٍ. إِن تَدْعُوهُمْ لَا يَسْمَعُوا دُعَاءَكُمْ وَلَوْ سَمِعُوا مَا اسْتَجَابُوا لَكُمْ وَيَوْمَ الْقِيَامَةِ يَكْفُرُونَ بِشِرْكِكُمْ وَلَا يُنَبِّئُكَ مِثْلُ خَبِيرٍ﴾

**“Bu sizin Rəbbiniz olan Allahdır, hökm Onundur. Sizin Ondan qeyri köməyə çağırdıqlarınız bir çəyirdək qabığına belə sahib deyillər.**

**Əgər siz onları çağırsanız (dua etsəniz), onlar sizin çağırışınızı eşitməzlər, eşitsələr də cavab verə bilməzlər. Özləri də Qiyamət günü sizin (Onları Allaha) şərik qoşduğunuzu danacaqlar. (Ya Peyğəmbər!) Heç kəs sənə hər şeydən xəbərdar olan (Allah) kimi xəbər verə bilməz!”**[240]

Həmçinin buyurmuşdur:

﴿فَابْتَغُوا عِندَ اللَّهِ الرِّزْقَ وَاعْبُدُوهُ وَاشْكُرُوا لَهُ إِلَيْهِ تُرْجَعُونَ﴾

**“Ruzini yalnız Allahdan diləyin. Ona ibadət edin, Ona şükr edin. Siz qiyamət günü Onun hüzuruna qaytarılacaqsınız. ”**[241]

Başqa bir ayədə isə Allah- təala Onu qoyub başqalarını özlərinə övliya seçənləri məzəmmət edərək buyurmuşdur:

---

239 -16) “ən-Nəhl” -20-21.

240 -35) “Fatir” - 13-14.

241 -29) “əl- Ankəbut” -17.

﴿مَثَلُ الَّذِينَ اتَّخَذُوا مِن دُونِ اللَّهِ أَوْلِيَاء كَمَثَلِ الْعَنكَبُوتِ اتَّخَذَتْ بَيْتًا وَإِنَّ أَوْهَنَ الْبُيُوتِ لَبَيْتُ الْعَنكَبُوتِ لَوْ كَانُوا يَعْلَمُونَ. إِنَّ اللَّهَ يَعْلَمُ مَا يَدْعُونَ مِن دُونِهِ مِن شَيْءٍ وَهُوَ الْعَزِيزُ الْحَكِيمُ. وَتِلْكَ الْأَمْثَالُ نَضْرِبُهَا لِلنَّاسِ وَمَا يَعْقِلُهَا إِلَّا الْعَالِمُونَ﴾

**"Allahdan başqa özlərinə övliya seçənlər özünə yuva qurmuş hörümçəyə bənzəyirlər. Evlərin ən zəifi isə, şübhəsiz ki, hörümçək yuvasıdır. Kaş biləydilər!**

**Şübhəsiz ki, Allah onların Allahı qoyub nəyə dua etdiklərini bilir. O, yenilməz qüvvət və hikmət sahibidir!**

**Biz bu məsəlləri insanlar üçün çəkirik. Onları yalnız (haqqı) bilənlər anlayarlar."**[242]

Həmçinin, Allah – təala Ondan qeyrilərinə bel bağlayaraq təvəkkül edənləri qınayaraq buyurmuşdur:

﴿وَلَئِن سَأَلْتَهُم مَّنْ خَلَقَ السَّمَاوَاتِ وَالْأَرْضَ لَيَقُولُنَّ اللَّهُ قُلْ أَفَرَأَيْتُم مَّا تَدْعُونَ مِن دُونِ اللَّهِ إِنْ أَرَادَنِيَ اللَّهُ بِضُرٍّ هَلْ هُنَّ كَاشِفَاتُ ضُرِّهِ أَوْ أَرَادَنِي بِرَحْمَةٍ هَلْ هُنَّ مُمْسِكَاتُ رَحْمَتِهِ قُلْ حَسْبِيَ اللَّهُ عَلَيْهِ يَتَوَكَّلُ الْمُتَوَكِّلُونَ﴾

**"Həqiqətən, əgər onlardan: "Göyləri və yeri kim yaratmışdır?!" – deyə soruşsan, mütləq: "Allah!" – deyə cavab verəcəklər. (Ya Peyğəmbər!) De: "Elə isə bir söyləyin görək, əgər Allah mənə bir zərər toxundurmaq (sıxıntı vermək) istəsə, sizin Allahdan qeyri dua etdikləriniz Onun zərərini aradan qaldıra bilərlərmi?! Yaxud: "Əgər Allah mənə bir mərhəmət əta etmək istəsə, onlar Onun mərhəmətinə mane ola bilərlərmi ?!" De: "Mənə təkcə Allah kifayət edər. Təvəkkül edənlər yalnız Ona təvəkkül edərlər! "**[243]

---

242 -29) "əl- Ankəbut" - 41-42-43.

243 -39) "əz-Zumər" - 38.

Həmçinin, buyurmuşdur:

﴿وَتَوَكَّلْ عَلَى الْحَيِّ الَّذِي لَا يَمُوتُ وَسَبِّحْ بِحَمْدِهِ وَكَفَى بِهِ بِذُنُوبِ عِبَادِهِ خَبِيرًا﴾

**“Ölməz, həmişə diri olana (Allaha) bel bağla və Onu həmd-səna ilə təqdis et (və ya Onun nemətlərinə şükr edərək namaz qıl). (Allahın) Öz bəndələrinin günahlarından xəbərdar olması (onları layiqincə cəzalandırmağa) kifayət edər.”** [244]

Ayədən anlaşılır ki, təvəkkül edilərək bel bağlanılan varlıq əbədiyyən diri olub ölməməlidir. Şübhəsiz ki, bu sifətə layiq yalnız Allah-təaladır.

Keçən ayələrdən məlumdur ki, insan yalnız Allahdan kömək istəyərək Ona bel bağlamalıdır.

Bir çox müsəlmanlar elə zənn edirlər ki, Allaha şərik qoşmaq deyildikdə yalnız Allahdan qeyrisinin göyləri, yeri, insanları və s. yaratmalarını etiqad etmək, yaxud da Allahdan qeyrisinə boyun əyərək namaz qılmaq deməkdir.

Bəli, şübhə yoxdur ki, yuxarıda adı çəkilənləri etiqad edən insan Rəbbinə şərik qoşmuş olur. Lakin bunlarla yanaşı Allahdan qeyrisinin yolunda sədəqə vermək, qurban kəsmək, Allahdan qeyrisinə dua edərək, ey filankəs, mənə kömək ol, mənə şəfa ver demək, yaxud Allahdan qeyrisinə təvəkkül edərək ona sığınmaq kimi ibadətlər də vardır ki, Allaha şərik qoşmaq sayılır. Əgər şərik qoşmaq yalnız Allahdan qeyrisinin yaradan olduğunu etiqad etməkdirsə, onda Allah-təala müşrikləri qınayaraq onları Cəhənnəm əzabı ilə qorxutmazdı. Çünki həmin müşriklər özləri göylərin, yerin və s. yaradanının yalnız Allah-təala olduğunu təsdiqləyirdilər.

Allah-təala buyurmuşdur:

﴿وَلَئِن سَأَلْتَهُم مَّنْ خَلَقَ السَّمَاوَاتِ وَالْأَرْضَ وَسَخَّرَ الشَّمْسَ وَالْقَمَرَ لَيَقُولُنَّ اللَّهُ فَأَنَّى يُؤْفَكُونَ﴾

---

[244] -25) “əl-Furqan” -58.

**“(Ya Rəsulum!) Həqiqətən, əgər (Məkkə müşriklərindən) “Göyləri və yeri kim yaratmış, günəşi və ayı kim ram (öz əmrinə, insanların mənafeyinə kim tabe) etmişdir?” – deyə soruşsan, onlar mütləq “Allah!” – deyə cavab verəcəklər. Elə isə onlar (tovhiddən, yalnız Allaha ibadət etməkdən) niyə döndərilirlər? ”** [245]

Bəziləri, Allahdan qeyrisinə edilən, ey filankəs, mənə övlad, ruzi, yaxud sağlamlıq ver kimi duaları yozaraq deyirlər ki, bu dua, ey filankəs, mənə Allahın ruzi verməsi üçün Allah yanında şəfaətçi ol deməkdir. Lakin cümlədən aydın olduğu kimi Allahdan qeyrisinə müraciət edərək nəsə istəmək onu şəfaətçi yox, əksinə, birbaşa onun özündən istəmək sayılır.

Çünki əks məna vermək nə Azərbaycan dilinin, nə də başqa dillərin leksikasına uyğun deyildir. Ona görə də Allahdan qeyrisindən yardım istəyənlərə göz yumaraq inkar etmir, əksinə, onlara bəraət qazandırırlar. Heç düşünmürlərmi ki, bu əməllərinə görə Allah qarşısında cavab verməli olacaqlar? Məgər onlar Allah-təalanın “Fatihə” surəsində buyurduğu:

﴿إِيَّاكَ نَعْبُدُ وإِيَّاكَ نَسْتَعِينُ﴾

**“Biz yalnız Sənə ibadət edirik və yalnız Səndən kömək diləyərik.”**[246] **-** ayəsini namazlarında dəfələrlə oxumurlarmı?

Allah-təala özlərinə Ondan qeyrilərini övliya tutaraq guya onların vasitəsi ilə Allaha yaxınlaşdıqlarını zənn edənlər barəsində buyurmuşdur:

﴿أَلَا لِلَّهِ الدِّينُ الْخَالِصُ وَالَّذِينَ اتَّخَذُوا مِن دُونِهِ أَوْلِيَاء مَا نَعْبُدُهُمْ إِلَّا لِيُقَرِّبُونَا إِلَى اللَّهِ زُلْفَى إِنَّ اللَّهَ يَحْكُمُ بَيْنَهُمْ فِي مَا هُمْ فِيهِ يَخْتَلِفُونَ إِنَّ اللَّهَ لَا يَهْدِي مَنْ هُوَ كَاذِبٌ كَفَّارٌ﴾

---

[245] -29) “əl-Ankəbut” - 61.

[246] -1)“əl-Fatihə”-5.

**“Bil ki, xalis din (sırf ibadət, təmiz itaət), ancaq Allaha məxsusdur. Allahı qoyub qeyrilərini özlərinə övliya tutanlar “Biz onlara yalnız bizi Allaha yaxınlaşdırmaq üçün ibadət edirik!” - (deyirlər). Şübhəsiz ki, Allah ixtilafda olduqları məsələlər barəsində (Qiyamət günü) onların arasında hökm edəcəkdir. Allah yalançı, nankor olan kimsəni doğru yola müvəffəq etməz!”** [247]

Həmçinin, buyurmuşdur:

﴿وَيَعْبُدُونَ مِن دُونِ اللّهِ مَا لاَ يَضُرُّهُمْ وَلاَ يَنفَعُهُمْ وَيَقُولُونَ هَـؤُلاء شُفَعَاؤُنَا عِندَ اللّهِ قُلْ أَتُنَبِّئُونَ اللّهَ بِمَا لاَ يَعْلَمُ فِي السَّمَاوَاتِ وَلاَ فِي الأَرْضِ سُبْحَانَهُ وَتَعَالَى عَمَّا يُشْرِكُونَ﴾

**“Onlar Allahı qoyub özlərinə nə bir xeyir, nə də bir zərər verə bilənlərə ibadət edir və “Bunlar Allah yanında bizdən ötrü şəfaət edənlərdir!” – deyirlər. De: “Allaha göylərdə və yerdə (Özünə şərik) bilmədiyi bir şeyimi xəbər verirsiniz? Allah Özünə şərik qoşulanlardan uzaqdır və ucadır! ”** [248]

Bu keçən açıq- aydın ayələrdən ağıl və bəsirət gözü açıq olanlar üçün  Allahdan qeyrilərinə dua edərək onları köməyə çağırmağın qadağan olduğunda heç bir şəkk- şübhə qalmamalıdır.

Onu da qeyd etmək istəyirəm ki, övliyalara, yaxud saleh insanlara qurban kəsməyi, onlara nəzir verməyi, onlardan yardım diləməyi inkar etməklə məqsədim onları hörmətdən salmaq deyildir. Şübhə yoxdur ki, övliyaların və Allah-təalaya ibadət edən saleh insanların Allah yanında hörmətləri qat-qat üstündür. Lakin Allahın övliyası deyildikdə kimlər nəzərdə tutulur? O insanlar ki, Rəblərinə ibadət edərlər, dinin buyurduğu beş əsası (namazı, orucu, zəkatı və s.) lazımınca yerinə yetirərlər, haram yeməzlər, özlərini camaat içində “Mən Allahın övliyasıyam” deyərək büruzə

[247]- 39) “əz-Zumər” - 3.

[248] -10) “Yunus” - 18.

verməzlər, təvazökarlıq edərlər, insanları Allah-təalaya ibadət etməyə çağırarlar və s. Bu gözəl sifətlərə malik olan insanlar Allahın həqiqi övliyalarıdırlar. Allah-təala onlar barəsində buyurmuşdur:

﴿أَلا إِنَّ أَوْلِيَاء اللّهِ لاَ خَوْفٌ عَلَيْهِمْ وَلاَ هُمْ يَحْزَنُونَ. الَّذِينَ آمَنُواْ وَكَانُواْ يَتَّقُونَ. لَهُمُ الْبُشْرَى فِي الْحَياةِ الدُّنْيَا وَفِي الآخِرَةِ لاَ تَبْدِيلَ لِكَلِمَاتِ اللّهِ ذَلِكَ هُوَ الْفَوْزُ الْعَظِيمُ﴾

**“Bilin ki, Allahın övliyalarının heç bir qorxusu yoxdur və onlar qəm-qüssə görməzlər.**

**O kəslər ki, iman gətirmiş və pis əməllərdən çəkinmişlər, onlara dünyada da, axirətdə də müjdə vardır. Allahın sözləri (verdiyi vədlər) heç vaxt dəyişməz. Bu, böyük qurtuluşdur (uğurdur)! ”** [249]

O kəslər ki, Allah-təalaya lazımınca ibadət etməzlər, insanları özlərinə cəlb etmək üçün dinin bəzi buyruqlarına naqis olaraq əməl edərlər ki, guya onlar Allah bəndələridirlər, insanlar arasında “mən övliyayam” deyərək mal-dövlət əldə edərlər, hətta, Allahı yox, birbaşa onları çağıraraq yardım istəyənlərə, onların adına qurban və nəzir verənlərə və s. etiraz etməzlər. Şübhəsiz ki, bunlar Allah-təalanın yox, əksinə, Şeytanın övliyalarıdırlar. Necə ola bilər ki, insan övliya ola, lakin Allah-təalanın nazil etdiyi Qurandan xəbəri olmaya? Allaha yox, ona yalvararaq kömək istənilə və o da bunlara göz yuma?

Allah-təala buyurmuşdur:

﴿وَإِلَى رَبِّكَ فَارْغَبْ﴾

**“Və ancaq Rəbbinə yalvar! (Üzünü Allaha çevirib, yalnız Onun köməyinə bel bağla, Ona tərəf yönəl!) ”** [250]

---

[249] -10) “Yunus” - 62-63-64.

[250] -94) “əş-Şərh” - 8.

Həqiqi övliyaların həyatına nəzər saldıqda, onların etdikləri gözəl ibadətlərini və saleh əməllərini gördükdə doğrudan da onların Allah-təalanın həqiqi saleh bəndələri olduqlarına heç bir şəkk-şübhə qalmır. Ona görə də, Allah-təala onların etdikləri ibadətləri və saleh əməlləri sayəsində onlara hər insana verilməyən neçə-neçə kəramətlər vermişdir ki, bu qeyri-adi olan kəramətlərə, yalnız Allah-təalanın övliyaları nail ola bilərlər. İnanılasıdır ki, əgər sağ ikən Allaha yox, onlara dua edilərək yardım istənilsəydi, onlar üçün qurban və ya nəzir verilsəydi, onlar heç vaxt bu əməllərdən razı qalmazdılar. Əksinə, inkar edərdilər. Çünki bu əməllər ibadətdir və ibadət olunmağa yalnız Allah layiqdir.

Allah-təala buyurmuşdur:

﴿وَمَنْ أَضَلُّ مِمَّن يَدْعُو مِن دُونِ اللَّهِ مَن لَّا يَسْتَجِيبُ لَهُ إِلَى يَومِ الْقِيَامَةِ وَهُمْ عَن دُعَائِهِمْ غَافِلُونَ. وَإِذَا حُشِرَ النَّاسُ كَانُوا لَهُمْ أَعْدَاء وَكَانُوا بِعِبَادَتِهِمْ كَافِرِينَ﴾

**“Allahı qoyub Qiyamətədək özünə cavab verə bilməyənləri köməyə çağıran kimsədən daha çox (haqq yoldan) azmış kim ola bilər?! Halbuki, bunlar onların çağırışından xəbərsizdirlər!**

**İnsanlar məhşərə toplanacaqları zaman bunlar onlara düşmən olacaq və onların ibadətini inkar edəcəklər.”** [251]

Allahın Peyğəmbərlərini və övliyalarını sevmək, onlardan yardım diləyərək qurban kəsməklə və s. yox, əksinə, onlara tabe olaraq etdikləri ibadətlərini və saleh əməllərini nümunə götürməklə bilinir.

**2. Allaha bidət və dində əsası olmayan şeylərlə təvəssül etmək**[252]

---

[251] -46) “əl-Əhqaf” - 5-6.

[252] -Bu mövzu geniş olduğu üçün təvəssül haqqında yazılan kitablara müraciət edin.

### 3. Allahdan ölüm istəmək

Elə insanlar vardır ki, başına bir müsibət gəldiyi zaman səbr etməyərək Allah-təaladan onu öldürməsini istəyərlər. Lakin belə dua edərək ölüm arzulamağı Peyğəmbərimiz *(sallallahu aleyhi va əlihi va səlləm)* qadağan etmişdir.

Ənəsdən *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Sizdən heç bir kəs başına gələn müsibətə görə ölüm arzulamasın. Əgər ölümü mütləq arzulamaq istəyərsə, belə desin: "Allahım, əgər yaşamaq mənim üçün daha xeyirlidirsə, məni yaşat! Əgər ölüm mənim üçün daha xeyirlidirsə, məni öldür!"*** [253]

### 4. Dünyada ikən cəzanın tezləşməsini istəmək

**Buna misal:** İnsanın "Ey Allahım, dünyada ikən mənim cəzamı ver ki, Qiyamət günündə Cənnətə daxil olum və Cəhənnəm əzabını görməyim" deməsidir.

Lakin belə demək düzgün deyildir. Əksinə, Allah-təaladan həm dünyada həm də axirətdə əzabdan onu uzaq etməsini istəməlidir.

Ənəsdən *(radiyallahu anhu)* rəvayət olunan hədisdə buyurur:

***"Peyğəmbər (sallallahu aleyhi va əlihi va səlləm) müsəlmanlardan olan bir xəstə kişini ziyarət etdi. O, artıq zəifləyərək cücə kimi olmuşdu. Peyğəmbər (sallallahu aleyhi va əlihi va səlləm) ona dedi: "Sən Allaha dua edərək Ondan nəsə istəyirdinmi?" Dedi: "Bəli. Deyirdim Allahım, mənə axirətdə cəza verəcəksənsə, onu dünyada ikən mənim üçün tezləşdir." Peyğəmbər (sallallahu aleyhi va əlihi va səlləm) buyurdu: "Subhənallah." Ona gücün yetməz, yaxud bacarmazsan. Belə deyə bilmirdinmi ki, Allahım bizə dünyada da, axirətdə də gözəl nemətlər ver, bizi cəhənnəm əzabından qoru ?!" Peyğəmbər (sallallahu aleyhi va əlihi va səlləm) onun üçün Allaha dua etdi və [Allah-təala da] ona şəfa verdi."*** [254]

---

[253] - Buxari, 6351; Müslim, 2680.

[254] - Müslim, 6776; Əhməd, 3/107; Tirmizi, 3487.

**5. Baş verməsi mümkün olmayan, şəriətin, yaxud ağlın qəbul etmədiyi nəyisə istəyərək dua etmək**

**Məsələn:** Dünyada əbədi yaşamağını, peyğəmbərlik verilməsini, Allah-təalanın Qiyamət gününü qopartmamasını, ölülərin dirilməsini, Allahı dünyada ikən görməsini, müsəlmanın Cənnətə girməməsini, yaxud kafir olaraq ölənin Cənnətə girməsini və s. istəmək. Bu cür dualar şəriətdə qadağan olunmuş dualardandır.

**6. İnsanın özünə, ailəsinə, yaxud malına bəd dua etməsi[255]**

**7. Günahın baş verməsi üçün dua etmək**

**Məsələn:** Kiminsə kafir olaraq ölməsini, içkiyə qurşanmasını, zina etməsini, yaxud Allah-təalanın onun üçün oğurluğu, soyğunçuluğu, fəsadı və s. asanlaşdırmasını istəmək kimi.

**8. Qohumluq əlaqələrinin kəsilməsi üçün dua etmək**

**Məsələn:** Allahdan ər-arvadın, qohum-əqrəbanın, ata-ana ilə övladın, müsəlmanların və s. aralarının vurulmasını istəmək.

**9. Günahın yayılıb çoxalması üçün dua etmək**

Yer üzündə günahın və fitnə-fəsadın çoxalmasını istəmək olmaz. Çünki Allah-təala fəsadı sevmir.

**Buna misal:** Bəzi insanların Mehdinin tez gəlməsi üçün fitnə-fəsadın çoxalmasını arzulamalarıdır.

**10. Allahın rəhmətini başqalarından əsirgəmək**

**Məsələn:** "Allahım, yalnız mənə ruzi, şəfa, elm və s. ver" demək. [256]

[255] - Bax: səh, 66.

[256] - Bax: səh, 69.

**11. Namazda imamın yalnız özü üçün dua etməsi**

İmamın arxasında namaz qılanlar onun duasına amin deyirlərsə, imam tək özü üçün yox, əksinə arxasındakıları da nəzərə alaraq, cəm halında dua etməlidir.

Sovbandan *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Özünə xüsusi dua edərək o biriləri yaddan çıxaran kəs heç bir qövmə imamlıq etməsin. Əgər belə edərsə, artıq onlara xəyanət etmiş olar. "*** [257]

Lakin imam səcdədə olarkən, yaxud namazın axırında salamdan qabaq tək özü üçün dua edə bilər. Necə ki, Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* belə edərdi.

**12. Allaha qarşı ədəbsizlik etmək**

Allaha layiq olmayan sözlərlə dua etmək Ona qarşı ədəbsizlikdir. Məsələn: Ey ilanların və əqrəblərin yaradanı kimi sözlər işlətmək. Xəttabi *(rahiməhullah)* demişdir: "Bütün məxluqatların yaradıcısı Allah olsa belə - ey itlərin, ey meymunların və donuzların Rəbbi, yaxud xoşa gəlməyən heyvanların və həşəratların Rəbbi demək, - bəyənilmir..." [258]

**13. Təcrübə, yaxud Allah-təalanı imtahan etmək üçün dua etmək**

**Məsələn:** Təcrübə üçün dua edərək duasının qəbul olub-olmayacağını imtahan etmək məqsədi ilə dua etmək.

**14. Dua edənin məqsədinin pis olması**

**Məsələn:** Allah-təalaya dua edərək insanlar arasında fəxr etməsi, yaxud günahların asanlaşması üçün mal-dövlət, elm, oğul-uşaq və s. istəmək.

---

[257] - Əhməd, 5/250; Tirmizi (hədis həsəndir demişdir), 357.

[258] - "Şənu-d-dua", 153.

**15. Dua edərkən Allahı duanın mənasına uyğun olmayan ad və sifətləri ilə çağırmaq**

**Məsələn:** Ey şiddətli əzab verən, mənə rəhm et, yaxud ey rəhmli olan Allah müsəlmanların düşmənlərinə əzab ver və s. kimi dualar etmək.

**16. Allahı Quranda və ya sunnədə varid olmayan adlarla çağıraraq dua etmək**

**Məsələn:** Ey Sultan, ey Ğufran, ey Sübhan, ey Burhan və s. kimi adlarla çağırmaq.

**17. Dua edərkən səsi ucaldaraq həddi aşmaq**

Allah-təala buyurmuşdur:

﴿ادْعُوا رَبَّكُمْ تَضَرُّعًا وَخُفْيَةً إِنَّهُ لاَ يُحِبُّ الْمُعْتَدِينَ﴾

**"Rəbbinizə yalvara-yalvara, həm də gizlicə dua edin. Şübhəsiz ki, O, həddi aşanları (qışqıraraq dua edənləri) sevməz. "** [259]

Bəzi təfsir alimləri dua edərkən səsi ucaldaraq qışqırıb-bağıranların ayədə keçən həddini aşanlardan olduqlarını demişlər.

Həmçinin, Allah-təala buyurmuşdur:

﴿وَاذْكُر رَّبَّكَ فِي نَفْسِكَ تَضَرُّعاً وَخِيفَةً وَدُونَ الْجَهْرِ مِنَ الْقَوْلِ بِالْغُدُوِّ وَالآصَالِ وَلاَ تَكُن مِّنَ الْغَافِلِينَ﴾

**"Səhər-axşam yalvararaq, qorxaraq, səsini qaldırmadan ürəyində Rəbbini yad et və qafillərdən olma! "** [260]

Həmçinin, buyurmuşdur:

---

[259] - 7) "əl-Əraf" - 55.

[260] - 7) "əl-Əraf" - 205.

﴿قُلِ ادْعُواْ اللّهَ أَوِ ادْعُواْ الرَّحْمَنَ أَيًّا مَّا تَدْعُواْ فَلَهُ الأَسْمَاء الْحُسْنَى وَلاَ تَجْهَرْ بِصَلاَتِكَ وَلاَ تُخَافِتْ بِهَا وَابْتَغِ بَيْنَ ذَلِكَ سَبِيلاً﴾

**"(Ya Rəsulum!) De: "İstər Allah, istərsə də Rəhman deyib çağırın (dua edin). Hansını desəniz, (fərqi yoxdur), çünki ən gözəl adlar (əsmayi-hüsna) yalnız Ona məxsusdur. " (Ya Peyğəmbərim!) Dua edərkən səsini nə çox qaldır, nə də çox alçalt. Bunun (bu ikisinin) arasında orta bir yol tut. "** [261]

Keçən ayələrdən aydın olur ki, dua edərkən səsi ucaldaraq qışqırmaq Allah-təalanın sevmədiyi bir əməldir. Ona görə də əgər dua edən imamdırsa, səsini arxasındakı namaz qılanların eşidəcəyi qədər qaldırmalı, lakin təkdirsə, yalnız gizlicə dua edərək özünün eşidəcəyi qədərdən artıq qaldırmamalıdır

### 18. Dua edərkən cəzm etmədən Allahın istəyinə buraxmaq

**Məsələn:** Allahım, istəyirsən məni bağışla, yaxud Allahım, istəyirsən mənə ruzi ver, kimi dualar etmək. Belə dualar etmək Allah-təalaya səmimi qəlblə, rəğbət və həvəslə dua edilməsinə ziddir və əksinə rəğbətin və istəyin az və ya zəif olmasına dəlalət edir. [262]

### 19. Allaha dua edərkən, sanki özünün Ona ehtiyacsız olduğunu düşünərək dua etmək

Belə dua edənlərə çox vaxt vəzifəsinə, yaxud mal-dövlətinə arxayın olanlar arasında rast gəlmək olar. Lakin unudulmuşdur ki, verən Allah onu geri almağa da qadirdir. Şübhəsiz ki, belə etmək Allaha qarşı olan təkəbbürlükdən meydana gəlir ki, belələrini Allah-təala Qurani-Kərimdə bir neçə yerdə məzəmmət etmişdir.

---

[261] - 17) "əl-İsra" - 110.

[262] - Bax: səh, 42.

**20. Dua edərkən qəsdən ağlayaraq səsi ucaltmaq**

Belə hallara çox vaxt Ramazan aylarında təravih namazlarında qunut tutularkən rast gəlmək olar. Belə etmək Peyğəmbərimizin yoluna xilaf, ixlasa zidd və riyaya daha yaxındır. Dua edərkən bəyənilən ağlamaq səmimi qəlbdən insanın özündən asılı olmayaraq içərisindən doğan ağlamaqdır. Əgər belə olarsa, ixlasa heç bir ziddiyyəti olmaz.

**21. İnsanın daima başqalarından onun üçün dua etmələrini tələb edərək qeyrilərinə bel bağlaması**

Elə insanlar vardır ki, özünü Allah yanında günahkar sanaraq alimlərdən, saleh insanlardan və s. onun üçün dua etmələrini tələb edir. Belə etmək şəriət baxımından icazəli olsa belə, aşağıda qeyd edilənlərlə nəticələnərsə tərk edilməsi daha da bəyəniləndir. Çünki başqalarından onun üçün dua etməsini tələb etmək bir neçə bəyənilməyən hallara gətirib çıxarır:

- Belə etmək başqalarından lüzumsuz yerə özünün qadir olduğu halda nəsə istəməyinə bənzəyir ki, bu da dinimizdə bəyənilməyən bir əməldir.
- Belə etmək duanın tərk edilməsinə və başqalarına bel bağlamasına səbəb olur.
- Belə etmək dua tələb olunan şəxsin özündən razı olaraq özünü Allahın övliyası və duası qəbul olunanlardan sanmasına gətirib çıxarar ki, bu da onu həlaka aparar.

Ona görə də insanın özünü günahkar və duasının qəbul olmadığını sanaraq mərhəmətli Rəbbindən ümidini üzərək başqalarına bel bağlayıb, duanı tərk etməsi düzgün deyildir. Əksinə günahlarının çoxluğuna baxmayaraq Allah-təalaya ümidlə dua etməli və bilməlidir ki, Rəbbinin rəhməti onu da əhatə etmişdir.

**22. Duanın qəbul olmasından ümidi üzmək**

Bir çox insanlar vardır ki, sağalması mümkün olmayan ağır bir xəstəliyə tutulduğu zaman Allahın ona şəfa verəcəyindən ümidini üzərək duanı tərk edər. Hətta, ola bilsin ki, Şeytan ona vəsvəsə verərək deyər ki, artıq sənin dua etməyinin faydası yoxdur. Ona görə də insan xəstəliyinin ağırlığına (xərçəng, taun və s.) aldanaraq Allahın ona şəfa verəcəyinə inanmır. Lakin unudur ki, onun hər şeyə qadir olan əzəmətli Rəbbi vardır. Dəfələrlə müşahidə olunmuşdur ki, bizə hələ ki əlacı məlum olmayan xərçəng xəstəliyinə tutulmuş bəzi insanlar Allaha üz tutaraq şəfa diləmişlər və Allah-təala da onlara öz mərhəmətini əsirgəmədən, heç bir tibbi müalicə olunmadan şəfa verərək həkimləri şok vəziyyətinə salmışdır. Həmçinin, sonsuzluğa məruz qalan bir çox insanlar da vardır ki, artıq dünyaya uşaq gətirməkdən ümidlərini üzərək hər şeyə qadir olan Rəblərinə dua etməkdən imtina edirlər. Belə etmək heç də müsəlmana yaraşan hal deyildir. Çünki anlamaq lazımdır ki, insanı sonsuz edən, yaxud dünyaya övlad gətirməyi gecikdirən Allah, tezliklə istədiyi bəndəsinə övlad bəxş etməyə də qadirdir. Baxın, Zəkəriyyə peyğəmbər *(aleyhissələm)* qoca və həyat yoldaşı sonsuz olduğu halda Allah-təalaya səmimi qəlbdən dua edərək ondan övlad tələb edir.

﴿هُنَالِكَ دَعَا زَكَرِيَّا رَبَّهُ قَالَ رَبِّ هَبْ لِي مِن لَّدُنْكَ ذُرِّيَّةً طَيِّبَةً إِنَّكَ سَمِيعُ الدُّعَاءِ﴾

**“(O zaman) Zəkəriyyə Rəbbinə dua edərək dedi: “Ey Rəbbim! Mənə də Öz tərəfindən pak bir övlad bəxş et! Sən, həqiqətən, duaları eşidənsən!”** [263]

Allah-təala da onun duasını qəbul edərək ona oğul bəxş edir.

﴿فَنَادَتْهُ الْمَلَآئِكَةُ وَهُوَ قَائِمٌ يُصَلِّي فِي الْمِحْرَابِ أَنَّ اللّهَ يُبَشِّرُكَ بِيَحْيَـى مُصَدِّقًا بِكَلِمَةٍ مِّنَ اللّهِ وَسَيِّدًا وَحَصُورًا وَنَبِيًّا مِّنَ الصَّالِحِينَ﴾

---

[263] - 3) “Əli İmran” - 38.

**“(Zəkəriyyə) mehrabda (ibadətgahda) ayaq üstə durub namaz qılarkən mələklər ona müraciət edib dedilər: “Allah sənə Özü tərəfindən gələn kəlməni (İsanı) təsdiq edən, (tayfasına) ağa, nəfsinə hakim və əməlisalehlər zümrəsindən bir peyğəmbər olacaq Yəhyanın (dünyaya gələcəyi) xəbərini müjdə verir.”** [264]

[264] - 3) “Əli İmran” - 39.

## DUANIN QƏBUL OLMASINA SƏBƏB OLAN BƏZİ AMİLLƏR

Duanın qəbul olmasına səbəb olan bir neçə şeylər vardır ki, artıq bu haqda kitabın əvvəlində duanın şərtləri və ədəbləri fəsillərində qeyd olunmuşdur. Həmin səbəblərdən bəziləri də aşağıdakılardır.

**1. İxlasla və səmimi qəlblə dua etmək**

Dua edərkən nə qədər ixlasın və qəlbin səmimiliyi güclü olarsa, o qədər də dua qəbul olmağa layiq olar. Buna misal olaraq Yunis peyğəmbərin *(aleyhissələm)* balığın qarnında olarkən etdiyi duasını və mağarada olanların çıxışlarını qaya parçası enərək örtdüyü zaman etdikləri dualarını misal gətirmək olar. Allah-təala buyurmuşdur:

﴿قُلْ أَمَرَ رَبِّي بِالْقِسْطِ وَأَقِيمُواْ وُجُوهَكُمْ عِندَ كُلِّ مَسْجِدٍ وَادْعُوهُ مُخْلِصِينَ لَهُ الدِّينَ كَمَا بَدَأَكُمْ تَعُودُونَ﴾

**“De: “Rəbbim ədaləti əmr etdi. Hər səcdədə (namaz vaxtı) üzünüzü (Qibləyə) tutun. Dini yalnız Ona məxsus edərək səmimi qəlbdən dua edin. Sizi (yoxdan) yaratdığı kimi, yenə Onun hüzuruna qayıdacaqsınız!”** [265]

**2. Duanın qəbul olmasına güclü ümid bəsləmək**

Budur Allahın peyğəmbəri Yaqub *(aleyhissələm)* oğlanlarının, qardaşları Yusifin *(aleyhissələm)* başına gətirdiklərini gördükdə belə buyurur:

---

[265] - 7) “əl- Əraf” - 29.

﴿وَجَاؤُوا عَلَى قَمِيصِهِ بِدَمٍ كَذِبٍ قَالَ بَلْ سَوَّلَتْ لَكُمْ أَنفُسُكُمْ أَمْرًا فَصَبْرٌ جَمِيلٌ وَاللّهُ الْمُسْتَعَانُ عَلَى مَا تَصِفُونَ﴾

**"Onlar (Yusifin) köynəyinin üstünə yalandan bir qan (ləkəsi yaxıb) gətirmişdilər. (Yəqub) dedi: "Xeyr, (heç də dediyiniz kimi deyildir), sizin öz nəfsiniz sizi bu işə sövq etmişdir (çirkin əməlinizi sizə gözəl göstərmişdir). Mənə yalnız gözəl (tükənməz, dözümlü) səbr gərəkdir. Dediklərinizdən (Yusif barəsində dediklərinizin yalan olduğunu sübut etməkdən) ötrü, ancaq Allahdan kömək diləmək lazımdır!"** [266]

Həmçinin, Binyamini və böyük oğlunu itirdikdə Allahdan yenə də duasını qəbul edəcəyinə ümid bəsləyərək belə deyir:

﴿قَالَ بَلْ سَوَّلَتْ لَكُمْ أَنفُسُكُمْ أَمْرًا فَصَبْرٌ جَمِيلٌ عَسَى اللّهُ أَن يَأْتِيَنِي بِهِمْ جَمِيعًا إِنَّهُ هُوَ الْعَلِيمُ الْحَكِيمُ﴾

**"(Qardaşlar Yəqubun yanına qayıdıb əhvalatı atalarına danışdıqdan sonra) o dedi: "Xeyr, sizin öz nəfsiniz sizi bu işə sövq etdi (pis əməlinizi sizə yaxşı göstərdi). (Bir dəvə yükü artıq ərzaq almaq xatirinə qardaşınızı bada verdiniz. Əvvələn, Binyamin heç vaxt oğruluq etməz. İkincisi, oğruluq edənin tutulub kölə edilməsi bizim şəriətimizdədir. Misir hökmdarı bizim şəriətimizi haradan bilir? Bunu siz ona demisiniz). (Mənə) yalnız gözəl (tükənməz, dözümlü) səbr (gərəkdir). Ola bilsin ki, Allah onların (oğlanlarımın) hamısını mənə yetirsin! O, həqiqətən, (hər şeyi) biləndir, hikmət sahibidir!"** [267]

Həmçinin, Yaqub peyğəmbərin *(aleyhissələm)* Yusifi tez-tez xatırlayaraq dərdə-qəmə düşdüyünü görən oğlanları onun bu işi unudaraq tərk etməsini tələb etdikləri zaman belə deyir:

---

[266] - 12) "Yusuf" - 18.

[267] - 12) "Yusuf" - 83.

﴿قَالَ إِنَّمَا أَشْكُو بَثِّي وَحُزْنِي إِلَى اللّهِ وَأَعْلَمُ مِنَ اللّهِ مَا لاَ تَعْلَمُونَ﴾

**"(Yəqub) belə cavab verdi: "Mən dərdi-sərimi yalnız Allaha ərz edirəm və Allahdan (gələn vəhy ilə) sizin bilmədiklərinizi (Yusifin vaxtilə gördüyü yuxunun çin çıxacağını, sizin və mənim ona təzim edəcəyimizi) bilirəm!"** [268]

O vaxt ki, Yaqub peyğəmbərin *(aleyhissələm)* oğlanlarını itirdiyinə görə dərdi-qəmi bir az da artır, lakin buna baxmayaraq o, yenə də Allaha olan ümidini üzməyərək belə deyir:

﴿يَا بَنِيَّ اذْهَبُواْ فَتَحَسَّسُواْ مِن يُوسُفَ وَأَخِيهِ وَلاَ تَيْأَسُواْ مِن رَّوْحِ اللّهِ إِنَّهُ لاَ يَيْأَسُ مِن رَّوْحِ اللّهِ إِلاَّ الْقَوْمُ الْكَافِرُونَ﴾

**"Oğullarım! Gedin Yusifdən və qardaşından (Binyamından) bir xəbər bilin. Allahın mərhəmətindən ümidinizi kəsməyin. Allahın mərhəmətindən yalnız kafirlər ümidini üzər!"** [269]

Nəticə nə olur? Allah-təala onun duasını qəbul edərək sevimli övladlarını bir daha ona qovuşdurur.

**3. Tövbə edib günahlardan çəkinmək**

Necə ki, Allah-təala Nuhun *(aleyhissələm)* dilindən buyurmuşdur:

﴿فَقُلْتُ اسْتَغْفِرُوا رَبَّكُمْ إِنَّهُ كَانَ غَفَّارًا . يُرْسِلِ السَّمَاء عَلَيْكُم مِّدْرَارًا . وَيُمْدِدْكُمْ بِأَمْوَالٍ وَبَنِينَ وَيَجْعَل لَّكُمْ جَنَّاتٍ وَيَجْعَل لَّكُمْ أَنْهَارًا﴾

**"Və dedim: "(Tövbə edib) Rəbbinizdən bağışlanmağınızı diləyin. Çünki O, (tövbə edən bəndəsinin günahlarını) çox bağışlayandır!**

**O sizə göydən bol yağış göndərər**.

[268] - 12) "Yusuf" - 86.
[269] - 12) "Yusuf" - 87.

**O sizə mal-dövlət, oğul-uşaq əta edər. O sizin üçün bağlar-bağçalar yaradar və çaylar axıdar! " "** [270]

Sələf alimlərindən olan Sufyana *(rahiməhullah)* deyilir ki, Allaha dua et.

Deyir: "Günahları tərk etməyin özü dua etməkdir." [271]

**4. Qəflətdən uzaq olmaq**

Dua edərkən insanın duasında nə dediyini düşünə-düşünə və anlayaraq etməsi duanın qəbul olmasına səbəb olan ən böyük amillərdən biridir. Bunun əksi isə duanın qəbul olmasına ən böyük bir maneədir.

Yəhya ibn Muaz *(rahiməhullah)* demişdir: "Allah-təala kimin duası ilə qəlbini bir yerə cəm edərsə, onun duasını geri qaytarmaz."[272]

**5. Fürsətlərdən istifadə etmək**

Fürsətlərdən istifadə etmək duanın qəbul olan vaxtlarını, hallarını və məkanlarını əldən buraxmayaraq dua ilə keçirməklə olur.[273]

**6. Çoxlu saleh əməllər işləmək**

Saleh əməllər duanın yüksələrək qəbul olmasına kömək olan ən böyük səbəblərdən biridir. Çünki dua etmək gözəl sözlərdəndir və gözəl sözün Allaha tərəf qalxması üçün saleh əmələ ehtiyacı vardır.

Allah-təala buyurmuşdur:

---

[270] - 71) "Nuh" - 10-12.

[271] - "Cəmiu-l-ulum va-l-hikəm", 1/276.

[272] - İbnu-l-Qayyim, "əl-Fəvaid", səh. 73.

[273] - Bax: səh, 75.

﴿مَن كَانَ يُرِيدُ الْعِزَّةَ فَلِلَّهِ الْعِزَّةُ جَمِيعًا إِلَيْهِ يَصْعَدُ الْكَلِمُ الطَّيِّبُ وَالْعَمَلُ الصَّالِحُ يَرْفَعُهُ وَالَّذِينَ يَمْكُرُونَ السَّيِّئَاتِ لَهُمْ عَذَابٌ شَدِيدٌ وَمَكْرُ أُوْلَئِكَ هُوَ يَبُورُ﴾

**"Hər kəs (dünyada) izzət-qüdrət (şərəf-şan) istəsə, (bilsin ki, dünyada da, axirətdə də) bütün izzət-qüdrət (şərəf-şan), ancaq Allaha məxsusdur. (Buna yalnız Allaha itaət və ibadət etməklə nail olmaq mümkündür). Pak söz (tovhid kəlməsi, zikr, həmd-səna və dua) Ona tərəf yüksələr və pak sözü də (Allah dərgahına) yaxşı əməl qaldırar. (Allah pak sözü eşidəndir, saleh əməli də qəbul edəndir). Pis əməllər edənləri şiddətli bir əzab gözləyir. Onların qurduqları hiylələr boşa çıxar**. " [274]

Vahb ibn Munəbbih *(rahiməhullah)* buyurmuşdur: "Saleh əməli olmadan dua edənin misalı ipsiz yayla ox atana bənzəyir." [275]

**7. Fərz ibadətləri tam olaraq yerinə yetirdikdən sonra nafilə ibadətlərlə Allaha yaxınlaşmaq**

Allah-təala Hədisi-Qudsidə buyurmuşdur:

*"Qulum mənə, ona fərz etdiyim ibadətlərdən sevimli olan heç bir şeylə yaxınlaşmamışdır. Qulum mənə nafilə ibadətlərlə də yaxınlaşmaqda davam edərsə, mən onu sevərəm. Əgər onu sevərəmsə… Məndən nə istəyərsə, (istədiyini) mütləq verərəm. Əgər Mənə sığınarsa, Mən onu mütləq qoruyaram."* [276]

**8. Yaxşı işləri əmr edərək pis işlərdən çəkindirmək**

Huzeyfə ibn əı-Yəməndən *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Canım əlində olan Allaha and olsun ki, ya yaxşı işləri əmr edərək pis işlərdən çəkindirməlisiniz, ya da Allah sizə elə bir əzab göndərər ki, Ona dua edərsiniz, lakin duanız qəbul olunmaz."*** [277]

---

[274] - 35) "Fatir" - 10.

[275] - İbnu-l-Mubarak, "Zuhd", 322.

[276]- əl- Buxari, 6137.

[277] - Tirmizi, 2169, hədis həsəndir demişdir; Əhməd, 5/288.

Qeyd olunanlar duanın qəbul olmasına səbəb olan ən böyük amillərdir. Ümumən Duanın şərtlərini, ədəblərini və s. yerinə yetirərək onlara xilaf olan şeylərdən çəkinməklə duanın Allah yanında qəbul olmasına zəmanət vermək olar.

Həmçinin bu işlərin əksi isə; duanın geç qəbul olduğunu fikirləşmək, haram yemək, duada həddi aşmaq, yaxşı işləri əmr etməyərək pis işlərdən çəkindirməmək, çoxlu günahlara yol vermək və s. duanın qəbul olmasına mane olur.

İbn əl-Qayyum *(rahiməhullah)* demişdir: "Allaha dua edərək Ona sığınmaq qılınca bənzəyir. Qılınca yalnız itilik yox həmçinin onu vuran güclü əl də lazımdır. Nə vaxt ki, qılınc sağlam və nöqsansız, onu vuran əl isə güclü olar və onu vurmağa mane olan bir şey olmazsa düşmənə qələbə çalmaq olar. Əgər bunların üçündən biri naqis olarsa təsir də olmaz.

Əgər [dua edənin] özü saleh olmazsa, qəlbi ilə dilini bir yerə cəm etməzsə [dua edərkən fikri başqa yerdə olarsa] yaxud duanın qəbul olmasına mane olan bir şey olarsa [duanın] təsiri də olmaz."[278]

---

278 - "əl-Cavabu-l-Kəfi", səh. 14.

# DUANIN QƏBUL OLUB - OLMAMASI NƏYƏ DƏLALƏT EDİR?

Bilmək lazımdır ki, ümumən insanın duasının qəbul olması onun saleh və təqvalı olmasına dəlalət edir. Lakin bəzən hikmət və ya istidrac üçün bunun əksi də ola bilər. Məsələn: Allah-təala sevmədiyi bir bəndəsinin duasını qəbul edərək onun daha da haqq yoldan azması üçün mal-dövlət, oğul-uşaq və s. bəxş edərək ona möhlət verər ki, buna - istidrac deyirlər. Necə ki, Allah-təala buyurmuşdur:

﴿أَفَرَأَيْتَ الَّذِي كَفَرَ بِآيَاتِنَا وَقَالَ لَأُوتَيَنَّ مَالًا وَوَلَدًا . أَاطَّلَعَ الْغَيْبَ أَمِ اتَّخَذَ عِندَ الرَّحْمَنِ عَهْدًا . كَلَّا سَنَكْتُبُ مَا يَقُولُ وَنَمُدُّ لَهُ مِنَ الْعَذَابِ مَدًّا . وَنَرِثُهُ مَا يَقُولُ وَيَأْتِينَا فَرْدًا﴾

**“(Ya Rəsulum!) Ayələrimizi inkar edib “(Əgər Qiyamət qopsa, axirətdə) mənə mütləq mal-dövlət və övlad veriləcəkdir!” – deyən adamı (As ibn Vaili) gördünmü? Görəsən, o, qeybi bilmiş, yoxsa Rəhmandan (bu barədə) söz (əhd) almışdır?! Xeyr, onun dediklərini (əməl dəftərinə) yazacaq, əzabını artırdıqca artıracağıq. Onun dediyi şeylər (mal-dövləti, övladı) Bizə qalacaq və hüzurumuza tək-tənha gələcəkdir. (Bütün malını və övladını əlindən alacağıq və o məhşərə ilk dəfə dünyaya gəldiyi kimi lüt-üryan, heç kimsiz və heçnəsiz gələcəkdir). ”** [279]

Buna misal olaraq Allah-təalanın Şeytanın duasını hikmət olaraq qəbul etməsini də göstərmək olar. Allah-təala Şeytan barədə buyurmuşdur:

﴿قَالَ رَبِّ فَأَنظِرْنِي إِلَى يَوْمِ يُبْعَثُونَ . قَالَ فَإِنَّكَ مِنَ الْمُنظَرِينَ . إِلَى يَوْمِ الْوَقْتِ الْمَعْلُومِ﴾

**“(İblis) dedi: “Ey Rəbbim! İnsanların (qəbirlərindən qalxıb) diriləcəkləri günə (Qiyamətə) qədər mənə möhlət ver!” (Allah) buyurdu: “Sən möhlət verilənlərdənsən.” Ancaq məlum vaxtın**

---

[279] - 19) “Məryəm” - 77-80.

**gününə (İsrafil surunu birinci dəfə çalana və bütün məxluqat məhv olana) qədər! ”** [280]

Həmçinin, buyurmuşdur:

﴿وَلَا يَحْسَبَنَّ الَّذِينَ كَفَرُوا أَنَّمَا نُمْلِي لَهُمْ خَيْرٌ لِّأَنفُسِهِمْ إِنَّمَا نُمْلِي لَهُمْ لِيَزْدَادُوا إِثْمًا وَلَهُمْ عَذَابٌ




**“Küfr edənlər onlara verdiyimiz möhləti heç də özləri üçün xeyirli sanmasınlar! Bizim onlara verdiyimiz möhlət, ancaq günahlarını daha da artırmaları üçündür. Onlar alçaldıcı bir əzab görəcəklər! ”** [281]

Allah-təala İblisin duasını onu sevdiyinə görə yox, əksinə onun əzabının daha da artaraq alçaldılması üçün qəbul etmişdir.

Həmçinin, onu da bilmək lazımdır ki, bəzən qulun duasının qəbul olmaması Allah-təalanın onu sevmədiyinə dəlalət etmir. Necə ki, Saddan *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***“Rəbbimdən üç şey istədim, ikisini qəbul edərək birini qəbul etmədi. İstədim ki, ümmətimi quraqlıqla həlak etməsin, istəyimi qəbul etdi, [həmçinin], istədim ki, ümmətimi [daşqınla, sellə] boğaraq həlak etməsin, [onu da] qəbul etdi, [lakin] istədim ki, ümmətimin arasına ixtilaf salmasın [bir-biri ilə ixtilaf etməsinlər], bunu isə qəbul etmədi.”*** [282]

Hədisdən məlum olduğu kimi Allah-təala hikmət olaraq bəşəriyyətin ən üstünü və Rəbbi yanında etdiyi hər bir duası qəbul olan Məhəmməd peyğəmbərin *(sallallahu aleyhi va əlihi va səlləm)* etdiyi üçüncü duasını qəbul etmir.

---

[280] - 15) “əl-Hicr” - 36-38.

[281] - 3) “Əli İmran” - 178.

[282] - Müslim, 7189.

## DUANIN GEC QƏBUL OLMASININ, YAXUD DA HEÇ QƏBUL OLMAMASININ SƏBƏB VƏ HİKMƏTLƏRİ

Mömininin başına gələn imtahanlardan biri də odur ki, Rəbbinə üz tutaraq təkrar-təkrar, uzun müddət və səmimi qəlbdən dua edə, lakin duasının qəbul olduğunu hiss etməyə. O zaman bunu görən Şeytan fürsətdən istifadə edərək həmin insana vəsvəsə verər və Rəbbi barədə cürbəcür pis zənlərə qapanmasına çalışar.

Lakin kimin başına belə bir iş gələrsə, Şeytanın vəsvəsələrinə uymayaraq, Rəbbi barəsində gözəl zəndə olsun və bilsin ki, əgər o duanın qəbul olması üçün bütün şərtləri yerinə yetirərək, səmimi qəlbdən Allaha dua etdikdən sonra duasının qəbul olmamağında böyük bir hikmət vardır ki, bunu da yalnız hər şeydən xəbərdar və hikmət sahibi olan Allah daha gözəl biləndir.

Yeri gəlmişkən həmin hikmətlərdən bir neçəsini qeyd etmək yaxşı olardı ki, hər bir dua edən qul həmin hikmətləri heç vaxt unutmasın.

### 1. Duanın qəbul olmaması Allahın qulunu etdiyi imtahandır və ona səbr etmək lazımdır

Duanın tez qəbul olması imtahan olduğu kimi, eləcə də gec və ya qəbul olmaması da Allah-təalanın qulunun səbrini yoxlaması üçün bir imtahandır. Allah-təala buyurmuşdur:

﴿كُلُّ نَفْسٍ ذَائِقَةُ الْمَوْتِ وَنَبْلُوكُم بِالشَّرِّ وَالْخَيْرِ فِتْنَةً وَإِلَيْنَا تُرْجَعُونَ﴾

**“Hər bir kəs (hər bir canlı) ölümü dadacaqdır. (Dözüb-dözməyəcəyinizi, şükr edəcəyinizi, yaxud nankor olacağınızı) yoxlamaq məqsədilə Biz sizi şər və xeyirlə (xəstəlik, yoxsulluq, ehtiyac və sağlamlıq, var-dövlət və cah-calalla) imtahana çəkərik. Və siz (Qiyamət günü əməllərinizin əvəzini almaq üçün), ancaq Bizim hüzurumuza qaytarılacaqsınız! ”** [283]

---

[283] - 21) “əl-Ənbiyə” - 35.

Ona görə də qul xeyir ilə imtahan olunarsa şükür etməli, şər ilə imtahan olunarsa səbr etməlidir. Duanın qəbul olmaması heç də bəla deyildir. Əsl bəla qulun öz yaradanını unudaraq qəflət içərisində yaşamasıdır. Ola bilsin ki, duasının qəbul olmadığını görən insan yenə də davamlı olaraq uzun- uzadı dua edər və Rəbbinə olan qəflətdən qurtulmuş olar.

**2. Allahın qulu üçün seçdiyi, qulun özü üçün seçdiyindən daha üstün və xeyirlidir**

Allah-təala sonsuz hikmət sahibidir. Yalnız hikmət olaraq verir və yalnız hikmət olaraq alır. Lakin ola bilsin ki, insan zahiri baxımdan bunu dərk etməyə. Necə ki, həkim xəstəni müalicə etdiyi zaman xəstə müalicə əsnasında müəyyən ağrılar duyur və həmin müvəqqəti ağrılara səbr edərək nəhayət Allahın izni ilə şəfaya nail olur.

Allah-təala buyurmuşdur:

﴿فَعَسَىٰ أَن تَكْرَهُوا۟ شَيْـًۭٔا وَيَجْعَلَ ٱللَّهُ فِيهِ خَيْرًۭا كَثِيرًۭا﴾ ...

**“...Ola bilsin ki, sizdə nifrət doğuran hər hansı bir şeydə Allah (sizdən ötrü) çoxlu xeyir nəzərdə tutmuş olsun.”** [284]

Zülm etmək heç də Allah-təalanın gözəl ad və sifətlərinə uyğun deyildir. Əksinə, sevdiyi quluna dünyada və axirətdə ona xeyir verəcək şeyləri nəsib edir. Məhz qul ola bilsin ki, istədiyinin aqibətindən xəbərdar olmadığı üçün Allah-təaladan elə bir şey tələb edə ki, zahirən onu özünə xeyir sana, lakin əslində isə bu ona xeyir yox, şər olsun. Necə ki, körpə uşaq şirin şeyi çox yeməsini istər, lakin sonda isə ona ziyan verəcəyini anlamaz.

Allah-təala buyurmuşdur:

---

[284] - 4) “ən-Nisə” - 19.

﴿كُتِبَ عَلَيْكُمُ الْقِتَالُ وَهُوَ كُرْهٌ لَّكُمْ وَعَسَى أَن تَكْرَهُواْ شَيْئًا وَهُوَ خَيْرٌ لَّكُمْ وَعَسَى أَن تُحِبُّواْ شَيْئًا وَهُوَ شَرٌّ لَّكُمْ وَاللّهُ يَعْلَمُ وَأَنتُمْ لاَ تَعْلَمُونَ﴾

**"(Allahın düşmənlərinə qarşı) döyüş (cihad) xoşunuza gəlmədiyi halda, sizə vacib edildi. Bəzən xoşlamadığınız bir şey sizin üçün xeyirli, bəzən də xoşladığınız bir şey sizin üçün zərərli ola bilər. (Onu) Allah bilir, siz bilməzsiniz. "** [285]

Ümumi olaraq bilmək lazımdır ki, insanın xeyir sanaraq arzuladığı hər bir şey ona xeyir gətirmir, əksinə şər də ola bilər.

### 3. Duasının qəbul olmaması ilə imtahan olunan insan, Allahın sevimli qullarının zümrəsinə daxil ola bilər

Çünki Allah-təalanın qulunu imtahan etməsi ona olan sevgisinə dəlalət edir. Necə ki, Ənəsdən *(radiyallahu anhu)* rəvayət olunan hədisdə Peyğəmbər *(sallallahu aleyhi va əlihi va səlləm)* buyurmuşdur:

***"Əcrin böyüklüyü imtahanın ağırlığına görədir. Əgər Allah-təala bir qövmü sevərsə, o qövmü imtahana çəkər. Kim razı olarsa, ona Allahın razılığı, kim qəzəblənərsə, ona Allahın qəzəbi vardır."*** [286]

### 4. Allah-təala qulunun ona qarşı razılığını imtahan edir

Əgər qul başına gələn hər bir müsibətlərə görə Rəbbindən narazılıq etməyərək, əksinə razı olarsa, şübhəsiz ki, Allah-təala da ondan razı olar və onu istəyinə qovuşduraraq razı salar. Mömin Rəbbinə hər zaman, davamlı olaraq dua edərək ondan nəsə istəyərsə, yaxud başına gələn müsibətin aradan qaldırılmasını tələb edərsə, lakin duasının qəbul olduğunun əsər-əlamətini görməzsə o zaman Allah-təala həmin bəndəsinin qəlbinə baxar. Əgər o

---

[285] - 2) "əl-Bəqərə" - 216.

[286] - İbn Macə, 4031; əl-Albani, "Sahihu-t-Tirmizi", 2/286.

Rəbbindən tam şəkildə heç bir narazılıq etmədən razı olarsa, Allah-təala da onu razı salması üçün duasını qəbul edərək istədiyini verər və başına gələn müsibətini aradan qaldırar. Həqiqətən də, səmimi qəlbdən uzun müddət dua edən, lakin duasının qəbul olmadığını görərək Rəbbindən zərrə qədər də olsa narazı olmayıb əksinə, razı olan qul həqiqi iman sahibidir. Lakin Allahın əmrindən narazı olaraq etiraz etmək heç də möminin sifətlərindən deyildir. Allah-təala buyurmuşdur:

﴿أَمْ حَسِبْتُمْ أَن تَدْخُلُواْ الْجَنَّةَ وَلَمَّا يَأْتِكُم مَّثَلُ الَّذِينَ خَلَوْاْ مِن قَبْلِكُم مَّسَّتْهُمُ الْبَأْسَاء وَالضَّرَّاء وَزُلْزِلُواْ حَتَّى يَقُولَ الرَّسُولُ وَالَّذِينَ آمَنُواْ مَعَهُ مَتَى نَصْرُ اللّهِ أَلا إِنَّ نَصْرَ اللّهِ قَرِيبٌ﴾

**“(Ey möminlər!) Sizdən əvvəlkilərin başına gələnlər sizin başınıza gəlməmiş behiştə daxil olacağınızımı güman edirsiniz? Onları (şiddətli) fəlakət və sıxıntı elə bürümüş, elə sarsılmışdılar ki, hətta, Peyğəmbər və iman gətirənlər birlikdə: “Allahın köməyi nə vaxt gələcək?” – demişdilər. Bilin ki, Allahın köməyi (sizə) yaxındır! ”** [287]

Həmçinin, Əyyub və Yaqub peyğəmbərin (aleyhiməssələm) başına gələn hadisə bizim üçün gözəl bir örnəkdir.

### 5. Allah-təala ilə ünsiyyətdə olaraq onun məhəbbətinə nail olmaq

Bəzən qulun duasının gec və ya heç qəbul olmamasının xeyri, onun Allah-təaladan tələb edərək müvəqqəti fani dünya həyatı üçün nəyisə istədiyindən qat-qat üstün ola bilər. Çünki insan duanın bütün vacibatlarını və ədəblərini yerinə yetirərək, daima ümidlə, səmimi qəlbdən dua edərsə, Allah-təalanın məhəbbətini qazanmış olar ki, bunun da mükafatı əbədi olan Cənnətdir. Çünki Allahın məhəbbətini qazanmaq onun Cənnətini qazanmaq deməkdir.

---

[287] - 2) “əl-Bəqərə” - 214.

**6. Duanın gec və ya qəbul olmaması qulun öz nəfsini hesaba çəkməsinə səbəb olur**

Ola bilsin ki, duanın gec və ya heç qəbul olmamasının səbəbi dua edənin özündən asılı olsun. Məsələn: Əgər dua edənin yeməyində haram varsa və ya duasının qəbulunun qarşısını alan günahlara yol verirsə, yaxud dua əsnasında duanı dili və qəlbi ilə yox, yalnız etdiyi duanın mahiyyətinə varmadan dili ilə edirsə, duasının qəbuluna mane olmuş olar. Belə halda, duasının qəbulunu görməyən hər bir iman sahibi öz nəfsini hesaba çəkərək özündə olan naqisliyi axtarar, günahlardan çəkinərək tövbə edər və Rəbbinə tərəf dönər ki, buna səbəb onun duasının qəbul olmaması olar. Halbuki, əgər duası tez qəbul olarsa, özündən qafil olaraq nəfsini hesaba çəkməz və əksinə özünü güclü iman sahibi zənn edərək həlak etmiş olar.

**7. Ola bilsin ki, insan günahları ilə duasının qəbuluna mane ola**

Elə insan vardır ki, daima Rəbbindən narazılıq edərək duasının qəbul olmadığından şikayətlənir. Lakin özünə diqqətlə nəzər salsan görərsən ki, dua etdiyi Rəbbinə heç bircə dəfə də olsun boyun əyərək namaz qılmamışdır. Əksinə, haramlara qurşanaraq həmişə Ona üsyanda olmuşdur. Beləsi duasının qəbul olmadığından gileylənməsin! Əksinə, Allaha şükür etsin ki, onun sağlamlığını günahlarına görə əlindən almamışdır və unutmasın ki, Rəbbinə qarşı üsyanda davam edərsə, başına gələcək müsibətlərə görə yalnız özünü qınamalıdır. Ona görə də kimliyindən asılı olmayaraq hər bir bəndə onu yaradanı unutmamalı və qafilliyindən tövbə edərək Ona tərəf yönəlməlidir ki, bu da onun dualarının qəbul olmasına səbəb olar. Əgər belə edərsə, Rəbbini razı salar və üzərinə bütün xeyir qapılarının açıq olduğunun yəqinliklə şahidi olar.

Allah-təala buyurmuşdur:

﴿وَإِذَا سَأَلَكَ عِبَادِي عَنِّي فَإِنِّي قَرِيبٌ أُجِيبُ دَعْوَةَ الدَّاعِ إِذَا دَعَانِ فَلْيَسْتَجِيبُواْ لِي وَلْيُؤْمِنُواْ بِي لَعَلَّهُمْ يَرْشُدُونَ﴾

**“(Ya Rəsulum!) Bəndələrim Məni səndən soruşduqda (söylə ki), Mən (onlara) yaxınam. Dua edib Məni çağıranın duasını qəbul edərəm. Gərək onlar da Mənim çağırışımı qəbul edib Mənə iman gətirsinlər. Bununla da, ola bilsin ki, doğru yola yetişsinlər. ”** [288]

**8. Şeytanla mübarizə apararaq savab qazanmaq**

Şeytan insanın açıq-aydın düşmənidir. Qulu Allah-təalanın yolundan azdırmaq üçün hər cür hiylələrə əl atır. Xüsusən də, insanda bir boşluq görərsə, həmin boşluqdan istifadə edərək vəsvəsə verməyə başlayır. Qul Rəbbinə dua edərsə, lakin duası qəbul olmazsa, o zaman Şeytan bu fürsəti əldən verməyərək qulun qəlbinə Allah barəsində pis zəndə olması, yaxud duanı tərk edərək qəbul olmasından ümidini üzməsi üçün müxtəlif fikirlər irəli sürər. Belə halda, əgər qul Şeytanla mübarizə apararaq onun vəsvəsələrinə məhəl qoymadan Allah barədə gözəl zəndə olarsa və ümidini üzməyərək dua etməkdə davam edərsə, Şeytanı qəzəbləndirərək Rəbbini razı salmış olar. Çünki Şeytanla mübarizə aparmaq ən böyük ibadətlərdəndir.

Əgər bir kəs duasının qəbul olmadığını görərsə və Şeytanın vəsvəsələrinə qələbə çalaraq duasında səmimi qəlblə davam edərsə, şübhəsiz, belə etməsi Rəbbinin yanında məqamının ucalığına səbəb olar ki, bu nailiyyəti əldə etməsi onun duasının qəbul olmasından qat-qat üstün olar.

**9. Ola bilsin ki, dua qəbul olsun, lakin dua edənin bundan xəbəri olmasın**

Artıq duanın fəzilətindən bəhs edərkən bizə məlum oldu ki, əgər insan duanın qəbul olmasına səbəb olan bütün amilləri yerinə

---

[288] - 2) “əl-Bəqərə” - 186.

yetirər və qəbuluna mane olan bütün şeyləri tərk edərsə, onun duası müxtəlif olaraq [289] Allah-təala yanında mütləq qəbul olmuş olar. Belə olduğu halda, bəs nə üçün qul duasının qəbul olmadığından narahat olur? Halbuki, o, duasının səmərəsini bu dünyada görməsə belə, axirətdə Allahın izni ilə mütləq görəcəkdir.

[289] - Bax: səh, 8.

# PEYĞƏMBƏRLƏRİN VƏ SALEH İNSANLARIN QƏBUL OLUNMUŞ DUALARINDAN BİR NEÇƏ NÜMUNƏ

## ADƏM PEYĞƏMBƏRİN DUASI

Adəm *(aleyhissələm)* İblisin hiyləsinə aldanır və Allah-təalanın ona qadağan etdiyi ağacdan dadaraq Allaha asi olur. Necə ki, Allah-təala buyurmuşdur:

﴿فَدَلَّاهُمَا بِغُرُورٍ فَلَمَّا ذَاقَا الشَّجَرَةَ بَدَتْ لَهُمَا سَوْءَاتُهُمَا وَطَفِقَا يَخْصِفَانِ عَلَيْهِمَا مِن وَرَقِ الْجَنَّةِ وَنَادَاهُمَا رَبُّهُمَا أَلَمْ أَنْهَكُمَا عَن تِلْكُمَا الشَّجَرَةِ وَأَقُل لَّكُمَا إِنَّ الشَّيْطَآنَ لَكُمَا عَدُوٌّ مُّبِينٌ﴾

**"Beləliklə, (Şeytan) onları batil sözlərlə aldatdı (onları aldadaraq uca yerlərdən, yüksək mərtəbələrdən aşağı endirdi). (Adəm və Həvva) ağacın meyvəsindən daddıqda ayıb yerləri (gözlərinə) göründü. Onlar Cənnət (ağaclarının) yarpaqlarından (dərib) ayıb yerlərinin üstünü örtməyə başladılar. Rəbbi onlara müraciət edib buyurdu: Məgər sizə bu ağacı (ağaca yaxınlaşmağı) qadağan etməmişdimmi? Şeytan sizin açıq-aşkar düşməninizdir, deməmişdimmi? "** [290]

Bundan sonra Adəm (aleyhissəlləm) Allah-təalaya dua edərək tövbə edir, Ondan bağışlanma və əfv diləyir. Allah-təala da onun tövbəsini qəbul edir.

Allah-təala buyurmuşdur:

﴿فَتَلَقَّى آدَمُ مِن رَّبِّهِ كَلِمَاتٍ فَتَابَ عَلَيْهِ إِنَّهُ هُوَ التَّوَّابُ الرَّحِيمُ﴾

**"(Nəhayət) Adəm Rəbbindən (bəzi xüsusi) kəlmələr öyrənərək (Həvva ilə birlikdə o kəlmələr vasitəsilə) tövbə etdi. Doğrudan da, O, (Allah) tövbələri qəbul edəndir, mərhəmətlidir. "** [291]

---

[290] - 7) "əl-Əaraf" - 22.

[291] - 2) "əl-Bəqərə" - 37.

## İBRAHİM PEYĞƏMBƏRİN DUASI

Allah-təala buyurmuşdur:

﴿وَإِذْ قَالَ إِبْرَاهِيمُ رَبِّ اجْعَلْ هَـذَا الْبَلَدَ آمِنًا وَاجْنُبْنِي وَبَنِيَّ أَن نَّعْبُدَ الأَصْنَامَ﴾

**“(Ya Rəsulum!) Xatırla ki, bir zaman İbrahim belə demişdi: “Ey Rəbbim! Bu diyarı (Məkkəni) əmin-amanlıq yurdu et. Məni və oğullarımı bütlərə tapınmaqdan uzaq elə! ””** [292]

İbn Kəsir *(rahiməhullah)* demişdir ki, artıq Allah-təala onun duasını qəbul edərək buyurmuşdur:

﴿أَوَلَمْ يَرَوْا أَنَّا جَعَلْنَا حَرَمًا آمِنًا وَيُتَخَطَّفُ النَّاسُ مِنْ حَوْلِهِمْ أَفَبِالْبَاطِلِ يُؤْمِنُونَ وَبِنِعْمَةِ اللَّهِ يَكْفُرُونَ﴾

**“Məgər (müşriklər) ətraflarındakı (başqa şəhərlərdəki) adamlar qamarlanıb götürüldüyü (əsir alındığı, öldürüldüyü, qarət edildiyi) halda, (içərisində yaşadıqları Məkkəni) onlar üçün müqəddəs, qorxusuz-xətərsiz bir yer etdiyimizi görmürlərmi? İndi batiləmi inanırlar? Allahın nemətinimi danırlar? ”** [293]

Həmçinin, buyurmuşdur:

﴿رَّبَّنَا إِنِّي أَسْكَنتُ مِن ذُرِّيَّتِي بِوَادٍ غَيْرِ ذِي زَرْعٍ عِندَ بَيْتِكَ الْمُحَرَّمِ رَبَّنَا لِيُقِيمُواْ الصَّلاَةَ فَاجْعَلْ أَفْئِدَةً مِّنَ النَّاسِ تَهْوِي إِلَيْهِمْ وَارْزُقْهُم مِّنَ الثَّمَرَاتِ لَعَلَّهُمْ يَشْكُرُونَ﴾

**“(İbrahim peyğəmbər dedi:) “Ey Rəbbimiz! Mən əhli-əyalımdan bəzisini (İsmaili və anası Həcəri) Sənin Beytülhəramının (Kəbənin) yaxınlığında, əkin bitməz bir vadidə (dərədə) sakin etdim. Ey Rəbbimiz! Onlar (vaxtlı-vaxtında, lazımınca) namaz qılsınlar deyə belə etdim. Elə et ki, insanların bir qisminin qəlbləri onlara (Kəbənin ziyarətinə, əhli-əyalıma**

[292] - 14) “İbrahim” - 35.

[293] -29) “əl-Ankəbut” - 67.

**mərhəmət göstərməyə) meyl etsin. Onlara (bu yerin ağaclarının) meyvələrindən ruzi ver ki, (nemətinə) şükür edə bilsinlər!" "**

Həmçinin buyurmuşdur:

﴿وَقَالُوا إِن نَّتَّبِعِ الْهُدَى مَعَكَ نُتَخَطَّفْ مِنْ أَرْضِنَا أَوَلَمْ نُمَكِّن لَّهُمْ حَرَمًا آمِنًا يُجْبَى إِلَيْهِ ثَمَرَاتُ كُلِّ شَيْءٍ رِزْقًا مِن لَّدُنَّا وَلَكِنَّ أَكْثَرَهُمْ لَا يَعْلَمُونَ﴾

**"(Qureyşlilər) dedilər: "Əgər biz səninlə birlikdə haqq yolu (İslam dinini) tutub getsək, (əksəriyyəti təşkil edən müşriklərin əlilə) yurdumuzdan tezliklə didərgin salınarıq". Məgər Biz onları Özümüzdən bir ruzi olaraq hər yerin meyvəsinin (hər cür meyvənin) daşınıb gətirildiyi, (daxilində Kəbə yerləşən) qorxusuz-xətərsiz (müqəddəs) bir yerdə (Məkkədə) sakin etmədikmi? Lakin onların əksəriyyəti (Allahın onlara bəxş etdiyi bu nemətin qədrini) bilməz!"** [294]

Bu Allah-təalanın lütfündən, səxavətindən, rəhmətindən və bərəkətindəndir ki, Məkkədə bar verən ağac olmadığı halda İbrahim peyğəmbərin duasının qəbulu olaraq ətraf yerlərdən oraya hər cür meyvələrdən daşınıb gətirilir. [295]

## ƏYYUB PEYĞƏMBƏRİN DUASI

Əyyub peyğəmbərin *(aleyhissələm)* bol-bol miniyi, davarı, əkini, övladları və s. var idi. Lakin Allah-təala onu imtahan edərək əlində olan mal-dövlətini ondan alır. Allahı zikr etmək üçün qəlb və dilindən başqa bədəninə də xəstəlik salır. Hətta yoldaşları belə ondan çirginərək uzaq durur və şəhərin bir kənarına çəkilərək tək yaşamaq məcburiyyətində qalır. Lakin ona sadiq qalan, hətta, onun ehtiyacını ödəmək üçün başqalarına belə qulluqçuluq edən yalnız həyat yoldaşı olur. Bütün bu çətinliklərə baxmayaraq

---

[294] - 28) "əl-Qasas" - 57.

[295] - "Təfsir-ibn Kəsir".

Əyyub peyğəmbər *(aleyhissələm)* səbr edərək Rəbbinə dua etməkdə davam edir və Allah-təala da onun duasını qəbul edir.

Allah-təala buyurmuşdur:

﴿وَأَيُّوبَ إِذْ نَادَى رَبَّهُ أَنِّي مَسَّنِيَ الضُّرُّ وَأَنتَ أَرْحَمُ الرَّاحِمِينَ فَاسْتَجَبْنَا لَهُ فَكَشَفْنَا مَا بِهِ مِن ضُرٍّ وَآتَيْنَاهُ أَهْلَهُ وَمِثْلَهُم مَّعَهُمْ رَحْمَةً مِّنْ عِندِنَا وَذِكْرَى لِلْعَابِدِينَ﴾

**“(Ya Rəsulum!) Əyyubu da (yada sal)! Bir vaxt o, Rəbbinə yalvarıb dua edərək belə demişdi: “Mənə bəla üz verdi (Sənə pənah gətirdim). Sən rəhmlilərin rəhmlisisən!”**

**Biz (Əyyubun) duasını qəbul buyurduq, onu düçar olduğu bəladan (xəstəlikdən və ailəsinə üz vermiş müsibətdən) qurtardıq. Dərgahımızdan (Əyyuba) bir rəhmət və (Allaha) ibadət edənlərə ibrət dərsi (öyüd-nəsihət) olsun deyə, (həlak olmuş) övladlarını qaytarıb ona verdik, üstəlik bir o qədər də əlavə etdik. ”** [296]

[296] -21) “əl-Ənbiyə” - 83-84.

## ZƏKƏRİYYƏ PEYĞƏMBƏRİN DUASI

Allah-təala buyurmuşdur:

﴿هُنَالِكَ دَعَا زَكَرِيَّا رَبَّهُ قَالَ رَبِّ هَبْ لِي مِن لَّدُنْكَ ذُرِّيَّةً طَيِّبَةً إِنَّكَ سَمِيعُ الدُّعَاء﴾

**"(O zaman) Zəkəriyyə Rəbbinə dua edərək dedi: "Ey Rəbbim! Mənə də Öz tərəfindən pak bir övlad bəxş et! Sən, həqiqətən, duaları eşidənsən! " "** [297]

Həmçinin, buyurmuşdur:

﴿وَزَكَرِيَّا إِذْ نَادَى رَبَّهُ رَبِّ لَا تَذَرْنِي فَرْدًا وَأَنتَ خَيْرُ الْوَارِثِينَ. فَاسْتَجَبْنَا لَهُ وَوَهَبْنَا لَهُ يَحْيَى وَأَصْلَحْنَا لَهُ زَوْجَهُ إِنَّهُمْ كَانُوا يُسَارِعُونَ فِي الْخَيْرَاتِ وَيَدْعُونَنَا رَغَبًا وَرَهَبًا وَكَانُوا لَنَا خَاشِعِينَ﴾

**"(Ya Rəsulum!) Zəkəriyyəni də (yada sal)! Bir vaxt o "Ey Rəbbim! Məni tək (kimsəsiz, varissiz) buraxma. Sən varislərin ən yaxşısısan! (Bütün məxluqat yox olar, ancaq Sən qalarsan!)" – deyə yalvarıb Rəbbinə dua etmişdi.**

**Biz (Zəkəriyyənin) duasını qəbul buyurduq, ona Yəhyanı bəxş etdik və zövcəsini (dünyaya uşaq gətirməyə) qabil bir hala gətirdik. Onlar xeyirli işlər görməyə tələsər (yaxşı əməllər etməkdə bir-birini ötməyə çalışar), ümid və qorxu ilə Bizə ibadət edirdilər. Onlar Bizə müti idilər."** [298]

## PEYĞƏMBƏRİMİZİN *(sallallahu aleyhi va əlihi va səlləm)* ƏLİ ÜÇÜN ETDİYİ DUASI

Əli *(radiyallahu anhu)* belə rəvayət edir:

***"Mən minik üzərində idim. Peyğəmbər (sallallahu aleyhi va əlihi va səlləm) yanımdan keçərkən, Allahım, əgər əcəlim yaxınlaşıbsa, mənə rəhm et... əgər başıma bəla gələcəksə, məni səbrli et - dediyim***

---

[297] -3) "Əli İmran" - 38.

[298] - 21) "əl-Ənbiyə" - 89-90.

***zaman dedi: "Necə dedin?" Mən duamı təkrarladım. Peyğəmbər (sallallahu aleyhi va əlihi va səlləm) dedi: "Allahım, ona afiyət və ya şəfa ver." Əli deyir: "Həmin duadan sonra heç vaxt ağrıdan şikayət etmədim."*** [299]

## PEYĞƏMBƏRİN *(sallallahu aleyhi va əlihi va səlləm)* ƏNƏS İBN MALİK ÜÇÜN ETDİYİ DUA

Ummu Suleymdən (radiyallahu anhə) rəvayət olunur ki, o, Peyğəmbərə *(sallallahu aleyhi va əlihi va səlləm)* belə dedi:

***"Ey Allahın Rəsulu, bu xidmətçin olan Ənəsdir. Onun üçün Allaha dua et." Peyğəmbər (sallallahu aleyhi va əlihi va səlləm) dedi: "Allahım, onun malını və övladlarını çoxalt. Ona verdiyin hər bir şeyi bərəkətli et. Ömrünü uzat və günahını bağışla." Ənəs (radiyallahu anhu) deyir ki, "vallahi, həqiqətən də, malım çoxdur, övladlarımın və nəvələrimin sayı bu gün yüzü keçir. Ömrüm o qədər uzanmışdır ki, hətta, insanlardan belə utanıram və arzu edirəm ki, Allah mənim günahımı da bağışlasın."*** [300]

## PEYĞƏMBƏRİN *(sallallahu aleyhi va əlihi va səlləm)* URVA ƏL-BƏRİQİ ÜÇÜN ETDİYİ DUA

***Peyğəmbər (sallallahu aleyhi va əlihi va səlləm) Urva əl-Bəriqiyə (radiyallahu anhu) bir qoyun alması üçün bir dinar verir. O isə həmin bir dinarla iki qoyun alaraq birini bir dinara satır və bir qoyun və bir dinarla Peyğəmbərin (sallallahu aleyhi va əlihi va səlləm) yanına gəlir. Bunu görən Peyğəmbər (sallallahu aleyhi va əlihi va səlləm) onun ticarətinin bərəkətli olması üçün dua edir. Ticarəti o qədər çox və bərəkətli olur ki, hətta, torpaq alsaydı belə ondan qazanc əldə edərdi.*** [301]

---

[299] - Tirmizi, 3564. Hədis səhihdir demişdir.

[300] - Müslim, 4/1928.

[301] - Buxari, 6/632; Əhməd 4/376.

## ÖMƏR İBN XƏTTABIN DUASI

Zeyd ibn Əsləm atasından, o da Ömərdən *(radiyallahu anhum)* belə dediyini rəvayət edir: "Allahım, mənə sənin yolunda şəhid olmağı qismət et və ölümümü Sənin Peyğəmbərinin şəhərində elə." Allah-təala onun duasını qəbul edərək Mədinədə şəhid olmasını nəsib edir. [302]

## HƏSƏN ƏL- BASRİNİN DUASI

Xəvariclərdən olan bir kişi Həsən əl Basrinin elm məclisinə gələrək onlara əziyyət verərdi. Bir gün Həsən əl Basridən həmin kişinin uzaqlaşdırılması üçün əmirə müraciət etməsini tələb edirlər. Lakin o, buna məhəl qoymur. Bir gün Həsən əl Basri dostları ilə oturarkən həmin kişi onların yanına gəlir və Həsən əl Basri deyir: "Allahım, onun bizə verdiyi əziyyəti artıq bilirsən. Onu bizdən istədiyin kimi uzaqlaşdır." Kişi tez yerə yıxılır və evinə ölmüş halda aparılır. [303]

## SƏİD İBN CUBEYRİN DUASI

Səid ibn Cubeyrin *(rahiməhullah)* bir xoruzu var idi. O gecələr həmin xoruzun səsinə oyanaraq gecə namazı qılardı. Lakin, gecələrin birində xoruz həmişəki kimi banlamayaraq səssiz qalır. Səidin gecə namazına durmaması ona çox ağır gəlir və deyir: "Bu xoruza nə olmuşdur! Allah onun səsini kəssin." Elə bu qarğışdan sonra bir daha xoruzun səsi eşidilmir.[304]

## DƏNİZ TƏLATÜMÜNDƏ EDİLƏN DUA

Əbu Muhəmməd ibn əbu Zeyd deyir ki, Abdullah ibn Hubeyb Əndəlus alimi və duası qəbul olunanlardan idi. Bir gün gəmidə gedərkən dənizdə təlatüm baş verir. Bunu görən Abdullah ibn

---

[302] - Musannəfu Abdi-r-Razzəq, 10/440.
[303] - İbn əbi-d-Dunyə, "Mucəbu-d-dua",səh. 66.
[304] - İbn əbi-d-Dunyə, "Mucəbu-d-dua" səh. 66.

Hubeyb dəstəmaz alaraq əllərini göyə qaldırır və deyir: "Allahım, əgər bu səfərim xalis Sənin və Peyğəmbərin sünnəsinin dirçəlişi üçündürsə, bizi bu çətinlikdən xilas et və bizə əzabını göstərdiyin kimi rəhmətini də göstər." Elə həmin an Allah-təala onları öz lütfi ilə düşdükləri bəladan xilas edir." [305]

## DUA İLƏ QURAQLIĞA YAĞAN YAĞIŞ

İbadət əhlindən olan bir kəs nəql edir ki, mən ailəm ilə səhrada yaşayırdım. Ətrafımızda olan bütün gölməçələr qurumuşdu. Ailəmə su gətirmək üçün uzaqlara üz tutdum. Lakin heç bir yerdən su əldə edə bilmədiyimi görüb evə qayıtdım. Yenə də sağa-sola göz gəzdirərək su axtarmağa başladıq. Bir damcı da olsa belə su tapmadıq. Uşaqlarım susuzluqdan taqətdən düşmüşdülər. İzzət və qüdrət sahibi, dualara cavab verən və bəndələrini darda qoymayan Rəbbimizə yalvararaq dua etməyi qərara aldım. Təyəmmüm edərək qibləyə yönəlib iki rükət namaz qıldıqdan sonra əllərimi qaldıraraq göz yaşlarımı axıda-axıda Rəbbimizin bu sözlərini:

﴿أَمَّن يُجِيبُ الْمُضْطَرَّ إِذَا دَعَاهُ وَيَكْشِفُ السُّوءَ وَيَجْعَلُكُمْ خُلَفَاء الْأَرْضِ أَإِلَهٌ مَّعَ اللَّهِ قَلِيلًا مَّا تَذَكَّرُونَ﴾

***"(Allahdan qeyri ibadət etdikləriniz yaxşıdır) Yaxud əli hər yerdən üzülüb darda qalan bir kimsə, ona dua etdiyi zaman onun duasını qəbul buyuran [sizdən] şəri sovuşduran, sizi yer üzünün varisləri edən kəs? Məgər Allahla yanaşı başqa bir (ibadətə layiq) İlahmı var? Siz nə az düşünüb daşınırsınız!"*** [306] - xatırlayaraq səmimi qəlbdən dua etməyə başladım. Vallahi yerimdən durarkən göydə bir buludun belə olmadığı halda uzaqdan bulud parçasının

---

305 - Səlim ibn İd əl-Hiləli, "ən-Nubəzu-l-mustətabə fi-d-dəavati-l-mustəcəbə", səh. 71.

306 - "ən-Nəml" - 62.

evimizin üstünə gəldiyini gördüm. Elə həmin an yağış yağmağa başladı. Bütün ətrafımızdakı gölməçələr su ilə doldu. Həmin sudan içib qüsl edərək dəstəmaz aldıq və Allah-təalaya çoxlu həmd-səna etdik. Bir qədər sonra mənzilimizdən uzaqlaşaraq ətrafa göz gəzdirdim, lakin yağışdan bir əsər əlamət görmədim və bildim ki, Allah-təala bu yağışı mənim duam ilə yalnız bizə yağdırmışdır.[307]

[307] -"Min acəibi-d-dua",səh. 47.

## SON SÖZ

Məni bu kitabı yazmağa müvəffəq edən Allah- təalaya həmd-səna edir və bu kitabın işıq üzü görməsində əməyi olan hər bir kəsə öz dərin minnətdarlığımı bildirirəm. Allah-Təalaya dua edib Ondan millətimizə hidayət verərək Peyğəmbərimizin doğru yoluna yönəltməsini, yaralı yerimiz olan bütün torpaqlarımızı düşmən tapdağı altından azad etməsini, ölkəmizdə sülh və əmin-amanlığın bərqərar olmasını, vətənimizin əxlaqsızlığa aparan saxta qərb mədəniyyəti ilə yox, bəşəriyyəti xoşbəxtliyə çıxaran əsil İslam mədəniyyəti ilə birgə inkişaf etməsini, xalqımızın, o cümlədən də bütün müsəlman xalqlarının bir-birinə olan sevgi-məhəbbətini artıraraq bir yumruq kimi etməsini istəyirəm. Həqiqətən də O, hər şeyi eşidən, görən və dualara cavab verəndir.

## KITABDA IŞLƏNƏN BƏZİ TERMİNLƏRİN İZAHI

*sallallahu aleyhi va əlihi va səlləm* - ona və ailəsinə Allahın xeyir-duası və salamı olsun.
*aleyhissələm* – ona Allahın salamı olsun.
*aleyhiməssələm* – onların hər ikisinə Allahın salamı olsun.
*radiyallahu anhu* – Allah ondan razı olsun.
*radiyallahu anhumə* - Allah onların hər ikisindən razı olsun.
*rahiməhullah* – Allah ona rəhmət etsin.

**Mündəricat**